*Bu kitab “**Nizami Gəncəvi.** Lirika”* (*Bakı, Gənclik, 1980*) *və*
*“**Nizami.** Lirika. Sirlər xəzinəsi. Şərəfnamə”* (*Bakı, Yazıçı, 1988*)
*əsasında təkrar nəşrə hazırlanmışdır*

Ön sözün müəllifi və elmi redaktor: **Xəlil Yusifli** *filologiya elmləri doktoru, professor*

**894.361’1 - dc 21**
**AZE**
**Nizami Gəncəvi. Lirika.** Bakı, “Lider nəşriyyat”, 2004, 160 səh.

Dahi Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvi “Xəmsə” ilə bərabər ömrü boyu lirik şeirlər yazmış və iyirmi min beytlik bir divan tərtib etmişdir. Hal-hazırda əldə olmayan bu divandan yalnız bəzi nümunələr üzə çıxarılıb nəşr edilmişdir. Əldə olunan şeirlər içərisində qəsidələr, qəzəllər və rübailər vardır. Yüksək sənətkarlıqla yaradılan və məzmun zənginliyi, ideya dərinliyi ilə diqqəti cəlb edən bu şeirlərə nikbin ruh hakimdir.

**ISBN 9952-417-05-3**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# NİZAMİ "DİVAN"INDAN QALAN İNCİLƏR

Yaxın və Orta Şərq ədəbiyyatında epik şerin ən böyük ustalarından biri sayılan Nizami lirik şerin də gözəl nümunələrini yaratmışdır. Şair ömrü boyu lirik şeir yazmaqda davam etmişdir. Otuz yaşlarında yazdığı "Coşdu qumrovlar, yola qalxıb düzəldi karvan" qəsidəsi, 1191-ci ildən sonra Nüsrətəddinə həsr etdiyi mədhiyyə, ömrünün sonlarında yazdığı "Qocalıq" şeri, Qızıl Arslanın və Əxistanın adı çəkilən qəzəllər, poemalarındakı ayrı-ayrı işarələr bu mülahizəni bir daha təsdiq edir. "Xosrov və Şirin"in sonunda xanəndələrin Nizami qəzəllərini oxuduğunu yazan şair "Leyli və Məcnun"da artıq Nizami "Divan"ını qarşısına qoyduğunu yazır. XIII əsr təzkirəçisi Dövlətşah Səmərqəndi Nizaminin lirik şeirlər divanının 20 min beytə yaxın olduğunu qeyd etmişdir. XIV əsrin görkəmli alimi Zəkəriyyə Qəzvini də şairin "Xəmsə"dən əlavə yaxşı bir "Divanı" olduğunu göstərmişdir. Bu divan XVII əsrdə Səfəvilərin dövlət kitabxanasında olmuş və Saib Təbrizi oradan bir çox şeirləri özünün "Səfinəyi-Saib" əsərinə köçürmüşdür.

Nizaminin lirik irsindən hazırda 6 qəsidə, 120 qəzəl, 30 rübai məlumdur. Əlbəttə, Nizaminin adına yazılan bir çox şeirlərin ona aid olması şübhə doğurur. Böyük söz ustasının lirik əsərləri haqqında istər müxtəlif ədəbiyyat tarixlərində, istərsə də ayrı-ayrı monoqrafiyalarda müəyyən mülahizələr irəli sürülmüşdür. Ən ciddi tətqiqatçılar şairin lirikasını onun epik əsərlərindən ayırmır, şeirlərinin məzmun və sənətkarlıq baxımından poemalarından geri qalmadığını yazırlar.

Nizaminin əldə olan lirik irsi klassik Şərq şerinin üç əsas şəklini – qəsidə, qəzəl, rübai şəkillərini əhatə edir. Dahi sənətkarın lirikasının çox az bir hissəsi olan həmin nümunələr onun bu sahədəki fəaliyyətini səciyyələndirməyə, lirik şeirlərinin əsas motivləri, ideya istiqaməti, sənətkarlığı haqqında danışmağa, müəyyən nəticələr çıxarmağa kifayət qədər imkan verir. Bu əsərlərdə xalq mövqeyindən çıxış edən şair dövrünün kəşməkəşli hadisələrinə ayıq münasibət bəsləyir, gah qəzəbini və heyrətini, gah xəbərdarlıq və şikayətlərini, gah qorxu və inamını əks etdirir, ədalətin, insanlığın, düzlüyün, dostluğun, əməksevərliyin bərqərar olmasına çalışır. Gah müəllim olub ağıllı nəsi-

hətlər verir, gah ittihamçıya çevrilib haqsızlığa, zülmə, acgözlüyə, riyakarlığa ölüm hökmü oxuyur.

"Xəmsə"də dövrün, mühitin geniş epik lövhələrini cızan şair lirik əsərlərində duyğu və düşüncələrini əks etdirir, bu duyğu və düşüncələri özünün şəxsi hissləri kimi ümumiləşdirir. Məhz buna görə şair ən kədərli əsərlərində də gah keçmişin ibrət dərslərini yada salır, gah gələcəklə qorxudur, həqiqəti aydınlaşdırır, bağlı gözləri açmağa, donuq vicdanlara hərarət verməyə, daş ürəkləri yumşaltmağa çalışır. Dünyanın ən böyük humanistləri, yəni İntibah dövrü sənətkarları kimi Nizami poeziyasının da bir məhvəri, bir qibləsi vardır ki, o da insandır. Ona görə də insana zidd olan bütün hallar Nizami poeziyasında müxtəlif mövqelərdən atəşə tutulur, onların başına qəzəb, nifrət alovları yağdırılır.

Nizaminin lirikası ilə poemaları arasında istər məzmun, istərsə də forma baxımından yadlıq, fərq axtarmaq tamamilə yersizdir. "Xəmsə"yə daxil olan əsərlər kimi şairin qəsidə, qəzəl və rübailəri də Yaxın Şərq, xüsusən Azərbaycan intibahının ən yüksək sənət nümunələridir. Lirikası da daxil olmaqla Nizaminin poeziyası IX əsrdən başlayaraq sürətlə inkişaf edən, bir çox Yaxın Şərq xalqlarının yaratdığı ədəbiyyatın həqiqi zirvəsi, haqlı olaraq bu ədəbiyyatda humanizmin ən yüksək təzahürü sayılır.

Nizaminin lirik poeziyasında onun qəsidələri məzmun zənginliyi, ideya dərinliyi və sənətkarlıq vüsəti ilə daha çox diqqəti cəlb edir. Şairin əldə olan qəsidələrinin sayı altıdır. Bunlardan biri mədhiyyə, biri fəxriyyədirsə, biri də sənətkarın qocalığından bəhs edir. Qalan üç qəsidə isə ictimai-fəlsəfi, əxlaqi qəsidə nümunəsidir. Nizaminin ictimai-fəlsəfi qəsidələri, sözün həqiqi mənasında yüksək ictimai-fəlsəfi lirika nümunələri olub, hökmdar və cəmiyyət, mühit və fərd, elm və din, ağıl və zaman kimi problemlər ətrafında düşüncələri əks etdirir.

Şair bəzən qəsidələrində dərin bir ehtirasla dünyanın məhv edilməsini arzulayır, çünki dünyada məzlumlara qan uddurulur. "Məzlumlar qan udduğundan sənin ölkənə qarışıqlıq düşübdür" – deyə şair dövrün hökmdarlarını ədalətə çağırır. Üzünü həmin hökmdarlara tutub deyir: "Səs sal, təpik vur, çünki sənin qafil ürəyin elə yatmışdır ki, bir də məhşərdə oyanar".

Nizaminin inkar etdiyi dünya məzlumlara qan udduran qafil ürəklər dünyasıdır. Belə bir dünyaya necə son qoymağın yollarını bilmə-

yən şair bəzən nəsihətə keçir, həyatın ən adi həqiqətlərini dövrün hakimlərinə çatdırmağa çalışır. Padşahın rəiyyətə göstərdiyi zülmün onun özünə ziyan, qayğısınınsa xeyir olduğunu söyləyir: "Darğa insaflı olsa, əmirliyə çatar, əmir ədalətli olsa, ölkəyə padşah olar. Hamının əlindən tut ki, hamı sənə dost olsun. Sən ki həmişə dost öldürənsən, kim sənə köməkçi olar?".

Tez-tez nəsihətdən ittihama, zaman-zaman da ittihamdan nəsihətə keçən şair bəzən xeyirlə şərin, gözəlliklə eybəcərliyin, ədalətlə zülmün qarşılıqlı münasibəti haqqında narahat düşüncələrə dalır, tragik nəticələr çıxarır:

Öküz üstündə tutub Yer kürəsi çünki qərar,
Bu yer üstündə nə qursan o xəsarətdə olar.
Pəncələşsə fələyin şiri ilə yer öküzü,
Varmı onda bu hünər sonra müsibətdə olar.
Qorxuram xain ürəklər doludur dünyada,
Öküz üstünlük edər, şir də xəcalətdə olar.
Hər zirək quş uça bilməz bu yaşıl göylərdə,
Çox göyərçin bu yaşıllıqda əsarətdə olar.

Nizaminin əldə olan lirik şeirləri içərisində qəzəl şəklində yazılmış olanlar daha çoxdur. İstər poemalarında, istər məşhur fəxriyyəsində şair daha çox qəzəllərini xatırladır, onların ərğənun sədası kimi xoş, dillər əzbəri, məclislər bəzəyi olmağından danışır. Şərq poeziyasında qəzəl janrının inkişafına uyğun olaraq Nizaminin qəzəllərində süjetlilik, mövzu vəhdəti özünü göstərir.

Şairin qəzəllərinin əsas mövzusu məhəbbətdir, özü də bu məhəbbət sırf sufi, ilahi məhəbbət və ya real məhəbbətlə sufiyanə məhəbbətin qarışığı deyildir. Şeirlərdəki məhəbbət real məhəbbətdir, yaşanmış duyğuların ifadəsidir. Şairin bir çox şeirlərində vüsal dəmlərindən doğan sevincin tərənnümü, məşuqədən sufi ədəbiyyatında olmayan bir tərzdə vüsal arzu edilməsi bu məhəbbətin real, dünyəvi sevgi olduğunu göstərir.

Gecə xəlvətcə bizə sevgili yar gəlmiş idi,
Üzü aydan da gözəl nazlı nigar gəlmiş idi.
Tər axıb gül yanağından, bulud örtmüşdü ayı,
Onu düşmənmi qovub, könlü qübar gəlmiş idi.

Ona mən göz yetirib xəlvəti baxdım, baxdım,
Ovçunun ovlağına körpə şikar gəlmiş idi.
Uyuyub hər ikimiz rahat olub bir yatdıq,
Bəxtimin bağçasına güllü bahar gəlmiş idi.

Burada real insan hərəkət və duyğuları ecazkar sənət dili ilə səmimi bir tərzdə tərənnüm edilmişdir. Aşiqlə məşuqə arasındakı münasibətlər o qədər insani cizgilərlə verilmişdir ki, onu rəmzi sufi məhəbbəti, Allaha məhəbbət kimi başa düşmək mümkün deyildir. Nizami əsil İntibah şairi kimi real, dünyəvi məhəbbəti tərənnüm etməklə, insanın sevmək, sevilmək, sevginin nəşəsi ilə yaşamaq hüququna bəraət qazandırır. Şair insanın cismani və mənəvi arzu və meyillərini tərənnüm etməklə həyat eşqini, gözəlliyi təsdiq edir. Şair bir qisim qəzəllərində vüsal dəmlərinin sevinc və şadlıq hisslərini əks etdirir, oxucusunu da sevincə, şadlığa səsləyir. "Ey qible şode həme cəhanra" misrası ilə başlayan qəzəl bu baxımdan səciyyəvidir. Şeirin sətri tərcüməsi belədir:

Ey bütün aləmin qibləsi olan,
Ey minlərlə ürəklərə rahatlıq verən,
Sənin gözəlliyinin ilk baharı
Bənövşə ilə ərğəvanı bir-birinə qatmışdır.
Sən ucalıq aləminin sərvisən,
Göyləri səcdəyə gətirmisən...
Nə qədər ki sağsan, şad yaşa.
Bir də bu zamanı kim tapar?
Ömür atı çox tez gedəndir,
Bir-iki gün onun yüyənini çək.

Sevgilini aləmin qibləsi, asimanı səcdəyə gətirən bir insan kimi təqdim edən, onu səcdəgahlara qarşı qoyan şair əslində insan gözəlliyinə vurulduğunu bildirir. Onu şad yaşamağa çağırır, ömrün qısa olduğunu xatırladır, bu qısa ömrü sevinc içərisində keçirməyi məsləhət bilir. Axirət dünyası, cənnət, cəhənnəm, Kəbə yada düşmür. Aləmin qibləsi olan insana yaşamaq tövsiyə edilir. Ömür insana bir dəfə verilir, insan bunu anlamalı, onu xoş keçirməlidir.

Poemalarında bir sıra parlaq qadın surətləri yaradan Nizami qəzəllərində qadını həm real varlıq, həm də həyatın bütün gözəllik-

lərini özündə cəmləşdirən ümumiləşdirici bir anlayış kimi götürür, həyata, insana, insanın arzu, amallarına məhəbbətini ifadə edir. Gələcəyə, idealın qələbəsinə inamla dolu olan

Sərxoşluq edən dövlət hüşyar olacaq bir gün,
İllərlə yatan bəxtim bidar olacaq bir gün –

mətləli qəzəl bu cəhətdən daha səciyyəvidir. Bu qəzəldə Orta əsr zülmət səltənətinin bir gün yeni, işıqlı bir aləmlə əvəz olunacağına bəslənilən inam ifadə edilmişdir. İnsanlığa məxsus ən nəcib sifətləri özündə birləşdirən aşiqin keçirdiyi yuxusuz gecələr hədər getməyəcək, bivəfa məşuqə bir gün səhv etdiyini anlayacaq, yarına yar olacaq, arzuların bağlı qapısı bir gün açılacaq, gecələr gündüzə çevriləcəkdir.

Nizami və onun lirik qəhrəmanı gələcəyə belə ümidlə baxdığından nikbindir. Bu, intibah dövründə – insanın hünər və qüdrətinə, onun arzularının gözəllik və qanuniliyinə inam gücləndiyi bir zamanda sənətin ən uca zirvəsində dayanan bir dühanın işıqlı gələcəyə dikilən baxışlarındakı sevinc parıltısının, idealın qələbəsinə yəqinlikdən doğan inamın ifadəsidir. Nizaminin bir sıra qəzəllərində sevincin, vüsalın, şən əhval-ruhiyyənin təsviri də bununla bağlıdır. Bu, oyanmış insan idrakının dinə, onun ehkamlarına meydan oxumasıdır.

Nizaminin qəzəllərinin müəyyən hissəsi də ictimai, fəlsəfi, əxlaqi məsələlərə həsr edilmişdir. Dövrünün ədalətsiz qanunları ilə barışa bilməyən şair poemalarında və bəzi qəsidələrində olduğu kimi, bu şeirlərdə də mühitindən son dərəcə narazı olduğunu bildirir. Gülşəni şadlıq qönçəsi bitirməyən bir zəmanədə üzünü insanlara tutub “torpaq ye, amma çörək üçün özgəyə əl açma” deyərək yüksək əxlaqi prinsiplər irəli sürür.

Cavanlıq köç edər, qoyma, gedər əldən, zaman keçsin
İnanma bir daha burdan qəribi-karivan keçsin,

mətləli qəzəl şairin həyat və insan haqqında, insanın həyatda vəzifəsi haqqında qənaətini əks etdirir. Həyat qısa olduğu üçün daha ayıq olmaq, onun qədrini bilib əbədi həyat qazanmağa çalışmaq gərəkdir.

Şair burada oxucusunu Kəbəyə, ibadətə çağırmır. Düzgün, xeyirli əməllərlə əbədi həyat qazanmaq mümkün və lazımdır, – deyir, mənalı gözəlliyi, mənalı ömrü qiymətləndirir, təsdiq edir, mənasız eyş-

işrətdə keçən həyatı küləklərə verilmiş bir ömür adlandırır. İnsanın sevinməyə və şadlanmağa haqqı olduğunu deməklə bərabər, şair ona insanlıq vəzifəsini də xatırladır.

Nizaminin lirikasının sufizmə yad olduğunu söyləmək də səhv olardı. Doğrudur, Nizami heç də Sənai, Əttar, Rumi, İraqi sayaq sufi sənətkar deyildir. Bununla belə, onu öz dövrünün müxalifət hərəkatından təcrid etmək də yanlışdır. Sufizm Orta əsrlər Yaxın Şərq intibahının ayrılmaz xüsusiyyətlərindəndir, insanın şəxsiyyətini ucaldan, müdafiə edən fikir cərəyanıdır. Ağıl və hissin ehkamçılığa, hakim ideologiyaya üsyanıdır. Məhz buna görə hakim təbəqələr sufizmlə bağlı olan bir sıra böyük şəxsiyyətləri tikə-tikə etmiş, bəzilərini diri-diri soydurmuşlar. Həllac Mənsur, Eynəlqüzzat, Sührəverdi, Nəsimi buna misal ola bilər. Belə olan surətdə dövrünün böyük mütəfəkkir şairi Nizami sufizmə biganə qala bilərdimi? Nizami də ehkamçılığa, sxolastikaya qarşı çıxmaq, azadfikirlilik təbliğ etmək üçün, əlbəttə, sufizmdən, onun anlayışlarından istifadə etmişdir.

Gər qürurun yox isə, lütf elə, meyxanəyə gəl,
Nərd atıb, badə içib kafər olan xanəyə gəl –

mətləli qəzəl belə şeirlərdəndir. Buradakı meyxanə, canan, aşiqlərin sərvəri olmaq kimi sözlər sufizmdə olduğu mənada işlənmişdir. Bu şeir həyatın gözəlliyini təsdiq edən, insanın nəcib sifət və əməllərinə bəraət qazandıran, lakin bunları sufi boyalarla, rəmzi şəkildə əks etdirən yüksək sənət nümunəsidir.

Yol çətin, aləm qaranlıq, atını bir yanə çək,
Varlığı gəl bir zaman can mülkünə, vicdanə çək –

mətləli qəzəl də məzmunu, forması baxımından yuxarıdakı şerə çox yaxındır. Başdan-başa zəmanəyə qarşı dərin etiraz hissi ilə yazılmış bu qəzəl ağır və mətin şeriyyəti, dərin məzmunu ilə şairin ictimai, fəlsəfi qəsidələrini xatırladır. Burada da eybəcərliyin inkarı əsasdır. Həyat yolunun çətin, mühitin qaranlıq olduğunu görən şair ömrün yüyənini çəkib ətrafa nəzər salmağa çağırır. "Təbiət qartallarını ünsiyyət bağından qov, şəriət hümalarını onların öz yuvasına qaytar"– deyərək bütün şərtilikləri, qondarma buxovları rədd edir, insan səadətinə zidd olan hər şeyin üzərindən gözəlliyin, insanlığın, əda-

lətin, ağlın xatirinə qələm çəkir. Gözəlliyin təsdiqi Nizami poeziyası, o cümlədən qəzəlləri üçün səciyyəvi cəhətdir.

Nizami müxtəlif məzmunlu lirik duyğuların ifadəsi üçün rübai janrından da məharətlə istifadə etmişdir. Biz burada da onu Şərq intibahının qüdrətli humanist nümayəndəsi kimi görürük.

Dünyada ədalətlə zəfər tapmışlar,
Zülm ilə bu dünyada zərər tapmışlar.
Hər yerdə paxıllıq hünəri danmışdır,
Mərdlər eyib örtüb də hünər tapmışlar.

Şairin nəyi inkar, nəyi təsdiq etdiyi bu şeirdə aydın ifadə olunmuşdur. Ədalətlə zülm, səxavətlə paxıllıq iki zidd keyfiyyət kimi qarşılaşdırılır, birinin xatirinə digəri rədd edilir.

Nizaminin zəngin irsindən kiçik bir hissə qalsa da, bunlar şairin lirik duyğularından, qənaətlərindən danışmağa kifayət qədər imkan verir.

Nizami Gəncəvinin lirik şeirlərinin bu nəşri şairin əsərlərinin ayrı-ayrı vaxtlarda tərcümə və çap edilmiş kitablarından götürülmüşdür. Bu şeirlərin bir qismi 40-cı illərdə tərcümə olunmuşsa, bir qismi də sonralar Nizaminin yeni tapılan şeirləri əsasında müxtəlif şairlər tərəfindən çevrilmişdir. Bu baxımdan Xəlil Rza Ulutürkün etdiyi tərcümələr də diqqəti cəlb edir. X.R.Ulutürk həm Nizaminin indiyə qədər tərcümə olunmayan şeirlərini, həm də vaxtilə tərcümə olunan bəzi şeirləri yenidən dilimizə çevirmişdir. Odur ki, əvvəlki tərcümələrlə yanaşı, həmin tərcümələrin də kitabda yer almasını zəruri bildir.

***Xəlil Yusifli***

Aşiqəm, əmrini ver aşiqi-nalanə, gülüm,
Yanına ya gəlim əql ilə, ya divanə, gülüm?

Sevirəm, qəlb ilə canım kimi cananımı mən,
Ölərəm, ya yetərəm sən kimi cananə, gülüm.

Sənə dost olmağıma cümlə şəhər düşman olub,
Məni əfv eylə, baxıb bir belə düşmanə, gülüm.

Harda görsəm səni, zülfündən öpüb yalvararam,
Aşiqəm, aşiqə yoxdur yazı, divan, a gülüm.

Sənsizəm, səndən uzaq kimsəni düşsün, demərəm,
Yetməyir əl sənə, yox səbr də hicranə, gülüm.

Vəslin həvəsi ömrümü son anə yetirdi,
Hicran qəminin xəncərini qanə yetirdi.

Karvansaradır qəmli könül eşq yolunda,
Bu dərd yatağı karvanı karvanə yetirdi.

Ömrün gəmisi ruzigarın dalğalarında,
Tufansız ötüb gör necə ümmanə yetirdi.

Tordan qurtaran quş ki, qayıtmaz tora bir də,
Keçmiş ömürü kim yenidən canə yetirdi?

Bilsən niyə biz bilməmişik qədrini vəslin?
Çünki bizi bəxt qəflətən ehsanə yetirdi.

Gözüm aydın, gözümə surəti-canan görünür,
Mişki-ənbər saçaraq ətrlə əfşan görünür.

Allaha şükr edirəm, ey gözümün nuru, bu gün
Yar gəlib göz önünə, sərvi-xuraman görünür.

Ayrılıq zəhrini daddım, acı da olsa, visal
İki dünyayə dəyər, eylə ki, hicran görünür?

Səni bir dəfə görənlər güvənir eşqimizə,
Nə üçün gözlərin, ey dil, belə giryan görünür?

Eşqini canım ilə bəslədi birlikdə könül,
Onsuz, ey sevdiciyim, can evi viran görünür.

Ey sənəm, vəslin ilə, öylə ki, şad oldu könül,
Yırtdı qəm köynəyini, gül kimi xəndan görünür.

Şadlığından alışıb yandı Nizami, dedi ki:
"Gözüm aydın, gözümə surəti-canan görünür".

Hər gecəm oldu kədər, qüssə, fəlakət sənsiz,
Hər nəfəs çəkdim, hədər getdi o saət sənsiz!

Sənin ol cəlb eləyən vəslinə and içdim, inan,
Hicrinə yandı canım, yox daha taqət sənsiz!

Başqa bir yarı necə axtarım, ey nazlı mələk,
Bilirəm, sən də dedin: “Yox yara hacət sənsiz!”

Sən mənim qəlbimə hakim, sənə qul oldu könül,
Sən əzizsən, mən ucuz, bir heçəm, afət, sənsiz!

Nə gözüm var – arayım mən səni, bəxtim də ki yox,
Nə də bir qaçmağa var məndə cəsarət, sənsiz!

Sən Nizamidən əgər arxayın olsan da gülüm,
Gecə-gündüz arayıb, olmadı rahət sənsiz!

Yenə tövbə evimi eşq xərab etmədədir,
Aşiq iftarını sevda meyi-nab etmədədir.

Könlümə bir mələyin sevgisi od saldı, adı,
Günü də, Zöhrəni də göydə sərab etmədədir.

Onun eşq atəşi hər qəlbə girər, amma nədən,
Tək mənim qəlbimi atəşdə kəbab etmədədir?

Gözlərin baxdı mənə, söylədi: səbr et, səninəm,
Doğrusu, səbr edərəm, ömr şitab etmədədir.

Ahu gözlüləri yatmış zaman ovlar ovçu,
Ömr röyadə şikar olmağa tab etmədədir.

Məsləhətdir, məni qovmaqdan isə versin əzab,
Yar bunu yaxşı düşünmüşdür, əzab etmədədir.

Gər Nizamini xəta isə həlak etdirmək,
Aşiqəm, yar məni öldürsə səvab etmədədir.

Sənsiz ölürəm, nigar, tez gəl!
Ömrüm başa yetdi, yar, tez gəl!

Fəryad ki, hicrində könül qan,
Qaldım qəm əlində zar, tez gəl!

Şadlıq gətirir, nə xoşdu qəmzən,
Mən tək bir əsiri var, tez gəl!

Oxla məni, qaşının kəmanın
Vəsməylə uzatma yar, tez gəl!

Qəsdin can isə, gəl al bu canı,
Səndən deyiləm kənar, tez gəl!

Səndən bizə yoxsa çarə, söylə,
İncitmə, bitib qərar, tez gəl!

Etdi sənə can fəda Nizami,
Al, et bizi bəxtiyar, tez gəl!

Röyadə mən cənnət şamın can içrə rəxşan tapmışam.
Ol şamə yüz pərvanəni bir anda qurban tapmışam.

Axtardım ətrin-ənbərin, gördüm cəlalın sərvərin,
Hüsnündə tale məzhərin, xanəmdə mehman tapmışam.

Müddətdi eşqi-ləb deyə, axtarmışam yarəb deyə,
Zülməti-şəbdə sevgiyə bir abi-heyvan tapmışam.

Böylə eşitdim, ol sənəm hüsnü-vəfanı qıldı cəm!
Gördüm cəmalın bircə dəm, bildim ki, ümman tapmışam.

Yorğun adam yatmaq dilər, təşnə suya çatmaq dilər,
Ay çeşməsi batmaq dilər, hüsnündə taban tapmışam.

Söylədilər ki, neyşəkər daim olur şirinü-tər,
Aldıqda mən böylə xəbər, sərvi-xuraman tapmışam.

Çıxsam bu şərhimdən kənar, təbi Nizami qan olar,
Olmaz xəzinə aşikar, mən gənci-pünhan tapmışam.

Nə gözəl, nə xoş gəlibdir belə daimi qəmin, yar.
Onu şadlığa dəyişməm, edirəm buna yəmin, yar.

Daha xoşdu cövrü yarın buna sən nə cür baxırsan?
O şirin nəvazişindən daha xoş gəlir səmin, yar.

Mən oyam, bacarmasam da, sənə xidmətim olur çox,
Sən osan ki, etməyir heç mənə çarə bir əlin, yar.

Dedin: "İstə vəsl məndən", "Tələsir ömür" dedim mən,
Bu ömüzlə vəslə yoxdur gümanım çatam yəqin, yar.

Sənə oxşamaz gözəllər, mələyim, tayın ki yoxdur,
Ürək özgəni sevərmi, buna olgilən əmin, yar.

Afərin hüsnünə, mən bir belə dilbər istərəm,
Gecələr şəm yanar, sən kimi gövhər istərəm!

Od ləbin, ud xalın, hər biri şəkkər kimidir,
Valehəm onlara mən, bir belə məcmər istərəm!

Duzda çox ləzzət olar, amma ki, şirin olmaz,
Duzlusan, həm də şirin, sən kimi şəkkər istərəm!

Sənin eşqinlə töküb, hər iki dünyanı bu gün,
Bir qədəhdən içərəm, mən belə sağər istərəm!

Mişk zülfün nə gözəl, aləmə ənbər dağıdır,
Gör nə xoşdur, gözəlim, bir belə ənbər istərəm!

Bağladın zülfünə qul tək bu Nizamini özün,
Söyləyir zülfün ucu, bir belə çakər istərəm.

Mənim tək köhnə bir dostu neçin qəmxar saxlarsan?
Var ol, əhsən deyir aləm, nə yaxşı yar saxlarsan.

Mənə xoşdur qəmim, canan, ona gəl dərman axtarma!
Sual etmə "Nədir dərdin?" əcəb bimar saxlarsan?..

Nə rəngdə sən olursan ol, səninlə mən varam daim,
Əgər təsbihə mayilsən və ya zünnar saxlarsan.

Səni mən dost sayırdım, sən məni düşmən hesab etdin,
Səninlə fəxr edirdim, sən məni naçar saxlarsan.

Əgər olsa qəmim yüngül, sənin qüssən olar asan,
Necə ki, könlümə xoşdur, məni, dildar, saxlarsan.

Səni daim Nizami öz əziz cananı bilmişdir,
Rəvamı sən onu, böylə, sitəmlə xar saxlarsan?

Ay üzlü nigarım, kimə mehman olacaqsan?
Bir söylə, kimin şəninə şayan olacaqsan?

Şahlıq çətiri var başın üstündə bu axşam,
Ənbər çətirinlə kimə sultan olacaqsan?

Şəkkər deməərəm mən sənə, ondan da şirinsən,
Dilbər, necə bir bəxtəvərə can olacaqsan?

Zülmət gecə, sən nurlu çıraq, bəd gözə gəlmə!
Ey abi həyat, sən kimə canan olacaqsan?

Getdin, necə bəs tab eləsin hicrə Nizami,
O, xəstə ikən sən kimə dərman olacaqsan?

Yaxşı bir söz degilən, ta şəkər ərzan olsun,
Yaxşı əl tut ki, sitəm, dərdü qəm asan olsun!

Qorxuram ki, verəsən dadimi öz qəlbindən,
Böylə söz, bəs böylə vədə necə payan olsun?

Oxşayıb acizi hər an belə istər dilbər,
Tez cəza hökmü verib, gec də peşiman olsun.

Ey pəri üzlü, Nizami səni gözlər, gəl, gəl,
Gəl, qarışqa evi bir mülki-Süleyman olsun!

Hüsnünü gördükcə, dilbər, ruzigarım xoş keçər,
Vəslinə çatdıqda halım, ey nigarım, xoş keçər.

Göstərəndə ol günəş simanı hər dəm aşiqə,
Hər iki aləm olar sanki baharım, xoş keçər.

Qaşların bənzər hilalə, surətin bədrə, gözəl,
Bu hilalə, bədrə baxdıqca mədarım xoş keçər.

Söyləsən lütf ilə bir söz sən, Nizami şairə,
Ömrü sərasər onun, ey gülüzarım, xoş keçər.

Xərab oldu könül mülkü, nigarım, eylə bir şəfqət,
Apardı gənci biganə, gözətçi eyləməz qeyrət.

İtibdir karivan gözdən, bu çöldə qalmışam tənha,
Nə köhlən var, nə də öncül, qədəm atmağa yox qüdrət.

Yatıb qaldım bu torpağın önündə sübhədək, yarəb,
Əcəb yoldur ki, bir töhfə bizimçün olmayır qismət.

Nizami, tapmısan artıq bu dünyadə gözəl günlər,
Köçüb getmək gərək burdan, qazan sən yol üçün sərvət.

Gecə xəlvətcə bizə sevgili yar gəlmiş idi,
Üzü aydan da gözəl nazlı nigar gəlmiş idi.

Tər axıb gül yanağından, bulud örtmüşdü ayı,
Onu düşmənmi qovub, könlü qubar gəlmiş idi?

Ona mən göz yetirib xəlvəti baxdım, baxdım,
Ovçunun ovlağına körpə şikar gəlmiş idi.

Uyuyub hər ikimiz rahat olub bir yatdıq,
Bəxtimin bağçasına güllü bahar gəlmiş idi.

Dedi: – Getmək dəmidir, söylə, nə istərsən yar?
Bir öpüş istədim ondan... Yeri var, gəlmiş idi.

Ağlayıb getdi o yar, göz yaşı yandırdı məni,
Odlara yandı dilim, sanki şərar gəlmiş idi.

Ey Nizami! – dedi, – birdən ayılıb, gördüm o yox,
Demə röyada bizə çeşmi-xumar gəlmiş idi.

Görün, önündə aşiqin şiri necə şikar edər,
Pələng kimi cavanları, bir anda biqərar edər.

Çəkib də kirpiyindən ox, o əyri yayda saxlayır,
Nə işdi ki, vurulmamış bu qəlbim ahü zar edər.

Alıb ləbin sorağını, dağıtmışam libasımı,
Görün, bu mey nə meydi ki, içilməmiş xumar edər.

Dedim o daş ürəklidən vəfa görüm, nə çarə ki,
Mənim bu şişə könlümü ələmlə səngsar edər.

Şəbin visalı hər səhər alışdırır xəyalımı,
O hər gecə bu könlümü, görün, nə tarümar edər.

Xəzinədirsə möhnətin, xərabələrdə məskən et,
Qərarsız könüldə, sor, nədən qəmin qərar edər?

Nə qədr zalım olsa da, Nizami, əl götürmə sən!
Gül istəyən cəfa çəkib, tikanla ruzigar edər.

Hüsnün gözəl ayətləri, ey sevgili canan!
Olmuş bütün aləmdə sənin şəninə şayan.

Gəl eylə inayət, mənə ver busə ləbindən,
Çünki gözəlin busəsidir aşiqə ehsan.

Sordum ki, "könül hardadır", aldım bu cavabı:
"Heç sorma, tapılmaz onu axtarsa da insan".

Rəhm eylə, deyib, sel kimi göz yaşımı tökdüm
Kim, qanım ilə əl yuma, ey afəti-dövran!

İnsafın əgər varsa, açıq de, bu Nizami,
Sənlə necə rəftar eləsin, ey mahi-taban?

Gəl söylə, cavabın nə olar sorğu zamanı,
Əhvalımı səndən soruşarsa Qızıl Arlsan?

Ey nazlı mələk və şux dilaram,
Sənsiz mənə yox qərarü-aram.

Ey badi-səba, apar peyamı
Söylə ona: “Ey gözəl güləndam,

Getdin və apardın hüsnü əqli,
Etdin məni öz yolunda sərsam.

Qəm şərbəti vermisən hesabsız,
Ey sərvqəddim, ürək təmənnam!

Məcnun kimi nalə eyləyib mən,
Leyli deyərəm də sübh ta şam.

Daim gəzərəm mən hər məkanı,
Olmaz tələbimə bir sərəncam.

Nə səndən olur mənə sifariş,
Nə meylə dolur əlimdəki cam.

Zülfündə düşüb tora bir ov tək
Qaldım necə gör fəqirü nakam?!”

Qurtar qəzəli daha, Nizami,
Get xəlvətə gir, otur, tut ehram.

Etdi qəmin, nigarım, ömrüm boyu əziyyət,
Çatmış səmayə ahım, bəsdir mənə bu zillət.

Dırnaqlarım töküldü bu sinəmi didməkdən,
Ötdü bıçaq sümükdən, yoxdur canımda taqət.

Gizlətmək olmaz əsla sövdanı bu cahanda,
Başqa cahana çatmış haqqında, bil ki, söhbət.

Könlüm sənin dalınca düşmüş yola nə vaxtdır,
Heç karivan onunçun bir eyləməz hidayət.

Söz verdin ki: "Nizami, vəslim olar müyəssər".
Canan, tələs, gəl indi ta əldə var fürsət.

Sərxoşluq edən dövlət, huşyar olacaq bir gün,
İllərcə yatan bəxtim, bidar olacaq bir gün.

Qalmaz bu qapı bağlı, var hər gecənin sübhi,
Dilbər belə heç qalmaz, dildar olacaq bir gün.

Əğyarımı cananım oxşarsa bu gün, əlbət,
Bu sevgili gözlərdə o xar olacaq bir gün.

Mən kafferi-eşq oldum, bildim ki, bu dastandan,
Boynumda onun zülfü zünnar olacaq bir gün.

Pərvanə, söndür şəmini, gəldi çiraği-canımız,
Qan ağla, ey gülzar sən, açdı güli-xəndanımız!

Olmuş gecə meydan sənə, canan, mənəm qurban sənə,
Gəldi ey Hindistan sənə, fəğfuri-Türkistanımız.

Bir sərvdir qəddin sənin, cənnətdə yox bərabərin,
Sən bir ağa, mən nökərin, biz bəndə, sən sultanımız.

Parlar yanağın şəm tək, pərvanə yandı sübhədək,
Biz təşnəyik, su ver içək, ey çeşmeyi-heyvanımız!

Lütf eylə bir, ey nazənin, Nizamiyə ol həmnişin,
Qət eylədin ollam sənin, bəs hardadır peymanımız?

Gecə keçmiş, mənə gəl bir məhi-taban ol sən,
Eşqinin həmdəmiyəm, süfrəmə mehman ol sən!

Dirilik çeşməsidir ləblərin, ey nazlı nigar!
Getməmiş canım əlimdən mənə canan ol sən!

Çatma gəl qaşlarını, aşiqə rəhm eylə bir an,
Gəl axıtma qanımı, can verəcək can ol sən!

Saralan çöhrəmə bax, dərdli sinəmdən tozu sil,
Çəkdiyim dərd ki sənindir, barı dərman ol sən!

Nə qədər od olub odlar vuracaqsan canıma,
Bir saat məclisimə sünbüli-reyhan ol sən!

Kakilin ay çətiri, mişk saçır zülflərin,
Bir qulundur bu Nizami, ona sultan ol sən!

Gül camalın gülə dedi: – Dur, pərdə sal üzündən,
Güllər zünnar bağlamışdır yanağından, üzündən.

Görürəm ki, qan örtmüşdür niqabını qönçənin,
Xəcalətdən bürünüb ki, görməyəsən bəlkə sən.

Qulac-qulac saçlarının açılanda mətai,
Bənövşələr köçmək üçün yük bağladı bilirsən.

O ərğəvan camalının bir işarə etməsi
Yasəməni lal eylədi, susən qaldı sözündən.

Əgər dava edirsənsə gülə söylə hökmünü
Çünki nərgiz xumar olmuş, yuxu yağır gözündən.

Nizamilə çox əlləşdi bülbül, etsin rəqabət,
Bu qəzəli eşidərkən susdu, getdi özündən.

Cavanlıq varikən əldə, gərək qədrin bilə insan,
Əmin olma gələr bir də bu mülkü tərk edən karvan.

Bükülmüş qəddinə bir bax qocalmış şəxsin, həsrətlə –
Cavanlıq günlərin, daim gəzər torpaqda sərgərdan.

Nə dövlət varsa dünyadə sənə ancaq ömürdür, bil,
Onun mənasını dərk et, çalış boş keçməsin bir an!

Geri dönməz keçən bir gün, ayıq ol daima sən də,
Rəva olmaz ki, məstlər tək keçə qəflətdə bu dövran.

Neçün sən hərzə işlərdə verirsən ömrünü badə,
Xeyirli işlərə sərf et, həyatı eylə cavidan!

Pul ilə almadın canı, biləsən qiymətin, qədrin
Ki, oğru da qədir bilməz oğurlarsa malı asan.

Əgər sən şadiman olsan qəmə heç bir zərər gəlməz,
Və ya qəmdən ölüb getsən, toxunmaz şadlığa nöqsan.

Nizami, səndə ruh varsa danış eşqü-məhəbbətdən,
Gözəl bir musiqi dinlə, şərab versin sənə canan.

Kimdir deyil, deyirsən, indi cahanda bədbəxt?
Bir yermi var ki, orda yaymaz fələk əsarət?

Ziynət verib, de, harda bir taleyə gəlin tək,
Bu ayinəyə bənzər, doqquz üzüklü xilqət?

Aləm bu isə, gördük, yoxdur onun üzündə
Bir zərrəcə sədaqət, bir zərrə nur, şəfqət.

Dərdi, qəmi nə varsa fərz eylə olmayıbdır,
Öylə düşün ki, yoxdur aləmdə böylə möhnət.

Bəslər fələk göbəkdə müşk ilə ənbər, ancaq,
Ta sıxmayınca olmaz onda elə lətafət.

Müşk ilə doldurarsa dövranı bu zəmanə,
Var müşkünün üzündə mütləq qandan işarət.

Tərk eylə bu cahanı, bəsdir daha, Nizami,
Bu əqrəbdən bu tasda sən gözləmə səadət.

Qoy sənə söyləsin, gözəl, aşiq öz hali-zarını,
Danlayasan bəlkə sən öz gözlərinin xumarını.

Sərzəniş eyləmə ona, valeh olarsan anbaan,
Görsən əgərçi güzgüdə ay kimi öz üzarını.

Qoyma fərağı tərk edə, hicrinə öyrəşib könül.
Qoymamış o, sənə yaxın ahi-şərər nisarını.

Arxalanan zaman sənə sevgilini unutma gəl,
Qoyma ki, ayrı ünvana çəksin o, rəxtü-barını.

Yusifi-qəlbi salmısan çahi-zənəxdə zindana,
İndi kömək qolun salıb çıxar o dilfikarını.

Nafə kimi qanım donar camalına səpəndə sən,
Könüllərə ətir saçan o zülfi-müşkbarını.

Üzrünə dil açan zaman lal olur aşiqin, inan,
Lütfünün ixtiyarına verib öz ixtiyarını.

Oldu Nizami qul sənə, əmrinə müntəzir durub
Əhdə vəfa edib ona göstər öz etibarını.

Xoşdur sənin yolunda, ey dost, əziyyət, möhnət,
Qəm köhləni çapırtmaq, ta var yolunda fürsət.

Gül çöhrənin önündə bir şam kimi dayanmaq,
Yanmaq gərək başilə, etmək canilə xidmət.

Canan, sənin fikrinlə xoşdur səni düşünmək,
Eşqinlə könlüm əsla olmaz bir an da rahət.

Xoşdur sənin önündə baş əymək, ey nigarım,
Başlar gərək tac ilə etsin o hüsnə hörmət.

Qəm sərrafı olubdur dünyadə bu Nizami,
Gizli qəmi, bəlanı açmağə varmı hacət?!

Könlüm sitəminlə canə yetdi,
Ahım odu asimanə yetdi.

Ayrılmaram ölməyincə səndən,
Qəm xəncəri qəlbə, qanə yetdi.

Eşqi necə gizlədim cahanda,
Şurim o biri cahanə yetdi.

Karvan hələ çatmamış, yolunda
Köç növbəti gəldi, canə yetdi.

Gözlə, gələrəm dedin, Nizami!
Tez gəl ki, zaman o anə yetdi.

Ey qibleyi-canım, dəxi meyxanədən əl çək!
Ey dini sevən, gəl rəhi-biganədən əl çək!

Qəlbimdəki şəmim kimi yan, canıma nur saç,
Fırlanma əbəs, adəti-pərvanədən əl çək!

Canü dilimi almısan, ey pərdənişin yar,
Bipərdə danış, pərdeyi-kaşanədən əl çək!

Meyxaneyi-eşqində ki, məstanə yıxıldım,
Sərməstləri qovma bu meyxanədən, əl çək!

Ya gül kimi al rəngimi, ya ətrimi qaytar,
Ya quş kimi sal damına, ya danədən əl çək!

Şahin kimi məskən sənə şahlar əli olmuş,
Qovma iki-üç qarğanı viranədən, əl çək!

Məstəm sənin eşqində, vüsalınla ayılt gəl,
Qarə qulunam, şiveyi-türkanədən əl çək!

Əfsanə deməzlər, gözəlim, sübh açılanda,
Sübhün açılıb, sən dəxi əfsanədən əl çək!

Çox söyləmişəm, söyləyirəm bir də, Nizami,
Can qoy rəhi-eşqində, bu peymanədən əl çək!

Mümkünmüdür məni qurban edəsən?
Dərdlərimi görüb dərman edəsən?

Göz yaşımla islanmadan bədənim,
Al qanıma məni qəltan edəsən?

Ürək demə, artıq əldən vermişəm,
Ona çarə özün, canan, edəsən!

Zəif ovam, saxla məni, öldürmə,
Heç dəyərmi məni qurban edəsən?

Göz dikmişəm dodağının şəhdinə,
Ümid var ki, bir gün mehman edəsən.

Bəlkə vurub ləblərinə möhrünü,
Nizamini bir Süleyman edəsən.

Ömrün boyu hal tutmağa sən etmədin adət,
Ey kaş tapasan halımızı sormağa fürsət.

Mən tək neçə xırmanı yanan var qəmin ilə,
Şəfqət eləməkçün edirik min dəfə minnət.

Bütxanədə, həm Kəbədə sənsən bizə məbud,
Hər yerdə səninçün edirik, bil ki, ibadət.

İncirsən əcəb ki, səni mən seyrə dalanda,
Sən də baxıb əğyarə mənə vermə əziyyət.

Yüzlərlə qəzəl söylədi mədhində Nizami,
Daş qəlbin əcəb eyləmədi onlara rəğbət.

Yol çətin, aləm qaranlıq – atını bir yanə çək,
Varlığı gəl bir zaman can mülkinə, vicdanə çək.

Qov könül bağça-bağından bu qara qarğaları,
İmtahan eylə, hüma quşlarını meydanə çək.

Könlümə oldunsa məhrəm, ey gülüm, aç pərdəni,
Hikmətin şərbətini al, başına mərdanə çək.

Əhli-ruh məclislərində heç zaman olma ağır,
Saqi tək, iç al şərab, hər işini səhmanə çək.

Məşğul olma zərrəcə cənnət-cəhənnəmlə, saqın,
Əz cəhənnəm başını, bir də qələm rizvanə çək.

Gərçi ruh aləminin hikmətinə çatdı əlin,
Ərşi titrət, gərdişin iplərini məstanə çək.

Get qədəmsiz o yolu, dilsiz danış hər sözünü,
Baxmadan gör, surəti-peymanəsin gəl canə çək.

Ey Nizami, bu qədər əsrar ki, sən açmısan,
Anlayan yox rəmzini, bəsdir onu pünhanə çək.

Sən könlümü almaq da dilərsənmi, a dilbər?
Solsun o böyük eşqinə bəslənmiş əməllər!

Bir xeyli zaman var ki, açılmır o gül ağzın,
Zəhmət çəkərək qırmadı püstən dəxi şəkkər.

Hər kirpiyinə bir pəri məftuni-zəbundur,
Zülfün dağılar, şurə gələr cümlə gözəllər.

Qəmzən nə yaman rövnəqi-islami yıxıbdır,
Tut başqa əməl, olma, gözəl, gəl belə kafər.

Səhralərə çıxsan, bilirəm, dilbəri-rəna,
Qibtə edəcək hüsnünə gün ayla bərabər.

Əqlə gələcək hər nə ki, divanələrin var,
Ruyindən əgər olsa kənar o qara tellər.

Ruh nuş eləyər, ləli-ləbin badə verərsə,
Çəng, ney, kaman inlər, göz olar onlara sağər.

Bu hüsnü camal ilə, bu ülvi görünüşlə,
Mümkünsə, bizə lütf eləyib ruyini göstər.

Tainki Nizami kimi hicranzadələr qoy,
Bel bağlayaraq qulluğa, olsun sənə çakər.

Dilbər, neçə bilsən, sənə bənzər nişanım var,
Qəlbim ləbinə, sübhüm isə zülfünə oxşar.

Qalxmaqçın üzənginə dizimdə hanı taqət?
Yox qüvvə cilovdan da tutam, sevgili dildar.

Hicran nə qədər varsa, vəfa ləfzini tutma!
Hicranda gərəkdir ola yar yarə vəfadar?

Hər busənə bir can verirəm, dəyməsə, alma,
Çün istəmərəm xeyrim üçün sən olasan xar.

"Səbr eylə" dedin, dərdimə döz, gözlə, Nizami!"
Məndə hanı səbr etməyə taqət, gör özün, yar!

Qəm yemə, bir yar var, axır sənə qəmxar olar,
Görsə ki, tənha qalıbsan, yar olar, dildar olar.

Nurlu bir tale dilərsən, yatma sən ta sübhədək,
Heç nə çatmaz yatmışa, tale ayıqla yar olar.

Sən hümasan, sərçələr xırmanlara çəksin hücum,
Sən ki salimsən, dəvayə möhtac o bimar olar.

Burda şahlar cəng edir, sən tirbarandan qorun.
Toyda əllər məclis içrə nazla şəkərbar olar.

Balda milçək batdı, yaxdı şəm də pərvanəni,
Kisəni tərrar apardı, dərdmənd əyyar olar.

Yol əgər yoxsa sərayə, qəm yemə, eyb eyləməz,
Şah ova çıxdıqda ancaq itçilər sərdar olar.

At qədəm bir dəm Nizami, tərk elə nakəsləri,
Ta gərək bir kəs nə vaxt bu ölkədə salar olar.

Üzün müştaqiyəm, ey dust, nədən bir an görünməzsən?
Sənə bəndə mənəm, söylə, kimin sultanı oldun sən?

O gözlər gül camalinlə ləbinçin şahidimdir, yar,
Divan etsən özünsən bil, mənə həm şahid, həm düşmən.

O hüsnə ayinədən baxsan, inan ki, qısqanar könlüm,
Onu pünhan tut, ey canan, amandır, yad nəzərlərdən.

Nə ənbərdir o zülfün ki, səbadən gizlidir sirri,
Onu tutduqca sən pünhan səba görmək dilər hərdəm.

Sənin ki, asitanından həyat adlı sular çağlar,
Sulansın keçdiyin yollar, gül açsın gül qədəmlərdən.

Saqi, nə yatıbsan, dur, mey ver ki, bahar gəldi,
Tale yenə iş üstə, köksündə vüqar gəldi.

Bir danə vəfa toxmu əkmişdim o gülşəndə,
Gül açdı haman danə, gülüzarinə bar gəldi.

Səpdi su ciyər çeşməm, könlün bağı gülləndi,
Bir böylə gözəl bağə nazilə şikar gəldi.

Solmuşdu, qarışmışdı min dərd ilə əhvalım,
Dirçəldi küsən könlüm, səbr ilə qərar gəldi.

İqbal nə gözəl gəlmiş, bundan da gözəl olmaz,
Qulluqda durub bəxtim, didarına yar gəldi.

Bütlər şahı hazirdir, şahlar şahı hazirdir,
Gövhər belə nurani, nərgiz də xumar gəldi.

Şükr eylə, Nizami, gəl tufanlar arasından
Bəxtin gəmisi çıxdı, fəthilə kənar gəldi.

Etmə gəl öz kamını bir böylə virandan tələb!
Etmə mətləb qönçəsin sən bağlı dövrandan tələb!

Qane ol, səbr eylə, ac qal, mərdlik eylə dəhrdə,
Etmə əsla sən çörək bir qeyr-insandan tələb.

Qanə düşmüş könlünü xar ilə bir cür şad elə,
Eyləmə ömrün boyu bir lalə Nemandan tələb.

Sıxma köhnə paltarınla heç zaman sən qəlbini,
Tazə paltar istəmə, sən etmə nadandan tələb!

Əziz elçi, könül yarı necədir?
Mən bimarın o nigarı necədir?

Gözəlliyi, məlahəti qalırmı?
Nə eləyir, işi, karı necədir?

Söylə, əmlik ahumuzun nərgizi,
Sünbülləri, çəmənzarı necədir?

Bulağından su içmişdir şəkərin,
Guşəsində laləzarı necədir?

Dost tutanı o yad saydı, könlümün
Düşmən olan dostu, yarı necədir?

Gecə-gündüz mən atəşdə yanıram,
Şux mələyin abidarı necədir?

Qan içməkdə yox nöqsanı zərrəcə,
Peşimanmı, söylə barı, necədir?

Bircə dəfə uf demədi ömründə,
Aşüftəhal yar qərarı necədir?

Yar qəmindən Yəqub oldu Nizami,
Əsrin Yusif şəhriyarı necədir?

Gördün nə bəla çəkdi başım eşqin ucundan?
Dözdüm qəminə, gəlmədi, bax, dostluğa nöqsan.

Məzlumların naləsinə adət edibsən,
Bəs naləmə meyl eyləmədin, sevgili canan?!

Eyb etməz, ürək vermə mənə, çünki gözəlsən,
Dil verməmək adətdi gözəllərdə binadan.

Söylə, bu Nizami necə səbr etsin, əzizim,
Eşqində qərarsız qalacaq, ey mahi-taban!

Ey gözəl afətlərə sultan olan!
Qoyma baxa hüsnünə düşman olan!

Mən deyiləmmi bütün əzam ilə,
Bir tükünə min dəfə qurban olan?

Miskinəm, ox atma zəif sinəmə,
Zərbənə dözməz belə nalan olan.

İçdin ürək qanımı sən mey kimi,
Oldum adı qəlb evi talan olan.

Qoy yıxılıb payini öpsün barı,
İndiyədək sevgisi pünhan olan.

Gül üzünü görməyə yox cürətim,
Qaşı kaman, kirpiyi peykan olan.

Aşiqi-sadiqsə hamı, doğrudur,
Yoxdu Nizami kimi şükran olan.

Diləyirdim mənə sən bir gecəlik yar olasan!
Əhdi, peymanı tutub, əhdə vəfadar olasan!

Gözlərin yadları gördükdə gülür nərgiz tək,
Bir tikandır mənə qəmzən, nola, qəmxar olasan!

Dostluğundan demişəm mən, neçə düşmən eşidib,
Məni əğyarə xəcil etsən, özün xar olasan!

Mənə dost ol, nə zərər, düşmənim olsun aləm,
Kimsədən qorxmaram, ancaq ki, düz ilqar olasan!

Sən nə quşsan, sınayım mən nə sayaq, söylə səni,
Hanı bir öylə könül bəndü giriftar olasan?!

Şəhər əhli sənin eşqində Nizami kimidir,
Nə rəva Axsitana munisi dildar olasan!

Sənəm, ey gözün fədası, bizə bir gətir səfa sən,
Nə olar vüsalin ilə verəsən bizə dəva sən?

Səni bir görüb danışmaq mənim istəyimdir, ey yar,
Sən o zülfünün qətari, elə dərdimə şəfa sən!

Füqərayə padşahlar, gözəlim, nəvaziş eylər,
Nə olar qapında saysan məni bir fəqir, gəda sən?

Sənə əhd edib Nizami, qul ola yanında, ey yar,
Onu qovma dərgahından, ona vermə min cəfa sən.

Hər gecə tədbir görür könlüm sənin hicranına,
Sübh tezdən bənd olur eşqin şirin sultanına.

Könlümü verdim sənə, mən-sən ki, bir can olmuşuq,
Başqa bir can varmı, yetsin başqa bir cananına?

Günləri bayram kimi şirin keçər baxsan, gülüm,
Sübh tezdən sən nəzər salsan əgər qurbanına.

Varmı cürət, qaldıram şəmşir sən tək atlıya,
Başım üstə tutmuşam, vur zərbəni qalxanıma.

Məclisində mən kimi mehman gərək daim sənin,
Gövhəri töksün üzə, qəsd eyləsin öz canına.

Sən ciyər didməkdən əl çək, ey pəri, et imtina,
Yoxsa qərq eylər səni bir gün ciyər öz qanına.

Gözlərimdən sel kimi tökdüm ciyər suyun bu gün,
Ta Nizaminin qubarı qonmasın eyvanına.

Baxsan cəmali-yarə, bir laləzar görərsən,
Ruxsari-yar önündə gülzarı xar görərsən.

Axtarma gül çəməndə, açmaz niqab qönçə,
Çün hüsni-yar önündə hər güldə xar görərsən.

Bir busə istəsən gər, sən ləli-yaridən bil,
Oxlar səni o, könlün al qan olar, görərsən.

Bir ömrdür qəmindən qəlbim qərarsız olmuş,
Keçsə yüz il də böylə, sən bu qərar görərsən.

Hərgah Nizami tək kim xudkamlığı unutsa,
Vəslə irib olar şad ol qəmküsar, görərsən.

Qönçə kimi min dərdə könul doldu cəfandan,
Ömr ötdü, xəbər yox niyə bəs əhdü vəfandan?

Sən dərdi, qəmi hey mənə vermək diləyirsən,
Mənsə, ürəyi bəxş edirəm eşqinə, canan.

Xəstə gözümün çarəsini sordum ürəkdən,
Göstərdi ayaq tozlarını dərdimə dərman.

Yüz köynəyi yırtdım ki, çatam vəslinə, dilbər,
Bəlkə mənə köynək olasan, ey mahitaban!

Sidq ilə sənə həmdü səna etdi Nizami,
Bəs, sən yenə də qətlinə fərman yazacaqsan?

Mənim ox qəlbimə dəymiş, gözüm pürxün, nədəndir?
Özün qəlbimdəsən, nəqşən olur birun, nədəndir?

Bu dünyadə mənim ancaq yeganə istəyim var,
Bəşər bir qəlbə sahibdir, belə şəbxun, nədəndir?

Fəzayi-eşqdə pərvaz bərabər etmişik biz,
Sənin mehrin gödək, eşqim mənim əfzun, nədəndir?

Tutardın dost məni əvvəl, nədən mehri unutdun,
Bu düşmənlik nədən doğdu, kənar oldun, nədəndir?

Şəfa qıldım bütün naçar ürəklər harda varsa,
Nizamiyə çatıb növbət, cəfa qıldın, nədəndir?

Sən hələ, bax, nocavansan, mən dəyişdim çox yaman,
Sən gözəlləşdin, mənimsə gəncliyimdən yox nişan.

Sən kimi bir nobaharla sanma təğyir eyləməz,
Bağü bağçam, hər nə var soldurdu bir badi-xəzan.

Sən Xəlilsən, mən odam, qarşında neçin sönməyim?
Mən ölüm, sən arzun tək ömr elə hər bir zaman.

Sən şikəst sandın məni, düzdür, şikəstəm, bəndəyəm,
Sən bilən qəlbdir bu qəlb, sən gördüyün candır bu can.

Sən bizi fərmanla yox, insafla dindir, sevgilim,
Lütfünə, insafına yalnız özünsən hökmran.

Qulluğunda qul kimi durmuş Nizami, rəhm elə,
Hər iki dünyadə könlüm səndən olsun kamiran.

O müşk tellərin sənin məzhəbi-dilbəri tutub,
O zülmkar qəmzələrin rəsmi-sitəmkəri tutub.

Gül üzünü görən bəşər bağladı bel qul olmağa
Canını azad eyləmiş, rütbeyi-çakəri tutub.

Bədnəzərin xətasına düşməyəsən deyə, səhər
Bir dua eylədim sənə, əldə o dəftəri tutub.

Layiqin olmasam da mən, yaş-quruma döz, ey gülüm!
Göz yaşım axdı sel kimi, bax ki, o hər yeri tutub.

Səninlə ilk dovda canı ucuz tutub, uduzmuşam,
Eyləmə eşqə hiylə sən, rütbeyi-davəri tutub.

Məsiha möcüzü kimi möcüzə göstərir ləbin,
Səni Nizami Gəncəvi eşqdə rəhbəri tutub.

Dinlədi harda könül yarımızın söhbətini,
Əl atıb cırdı həmən paltarını, xələtini.

Laübali kimi məqsəd güdərək satdı özün,
Aldı can nəqdi verib, nazlı, şirin afətini.

Mənə gəl eylə vəfa, söylədim, heç eyləmədin,
Almadın sayə nədən, söylə, ürək söhbətini?

Şadlığın balü pərin böylə neçin sındırdın?
O qanadlarla könül uçdu, tapıb şöhrətini.

Sən Nizamiyə ki, xətt çəkməmisən, nazlı nigar!
O bütün dostlara xətt çəkdi, qırıb ülfətini.

Fəxr elə yar ki, barını çəkirəm,
Saf ürəkdən qubarını çəkirəm.

Sərxoşam, bir şərabdır eşqin,
Bu səbəbdən xumarını çəkirəm.

Mən zəlili kənara atma, gülüm,
Səni ağuş baharıma çəkirəm.

Ruzigarım keçirsə cövrinlə,
Ürəyindən o narını çəkirəm.

Qoyma solsun çiçəklənən əməlim,
Hər zaman intizarını çəkirəm.

Bülbüləm mən, Nizami, gülşəndə
Gülünün ahü-zarını çəkirəm.

Ey nigarım, könlümü çaldın, füsunxan olma gəl!
Sən məni lal eylədin, bəsdir, zəbandan olma gəl!

Sən könül almaqla etdin, qıl nəzər, hər qəlbi şad,
Qorx bu məhrumun canından, qatili-can olma gəl!

İzn ver ta bir zaman seyr eyləyim gül hüsnünü,
Sanma ki, bir oğruyam, artıq, nigahban olma gəl!

Bağladım bel xidmətində zülfünə bir mur tək,
Muri qarət eyləməkdə bir Süleyman olma gəl!

Öylə ki, sürətlə ol sərxoş qayıtdı məclisə,
Badə ver sən bu Nizamiyə, girancan olma gəl!

Tanışdır gözlərim sən ilə canan,
Onlara işığı sən verdin hər an.

İlqarın düz olsun, dostumsan əgər,
Dolanır əyrilik içində dövran.

Gözəlim, zülfünü boynuma dola,
Düyünlər açılsın mənim canımdan.

Bir neçə günü sən Nizamilə ol!
Ki sonra bizi çox əzəcək hicran.

Öz yaman halımı açdım sənə, diqqət verəsən,
O qara gözlərinə azca nəsihət verəsən.

Bəlkə məndən də betər sən vurularsan özünə,
Baxmağın şölə sala, aynaya zinət verəsən.

Tutar ahım deyibən qorxudan ah çəkməmişəm,
Bəs rəvamı mənə sən bunca məşəqqət verəsən?!

Ey dağım, ey dayağım, qıyma yada arxalanım,
Umuram könlümə qüdrət və mətanət verəsən.

Sən zənəxdan quyusundan çıxar öz Yusifini.
Bir vəfa dolçası göndər ki, şəfaət verəsən.

Al qanım nafə kimi tez quruyan müşkə dönər,
Hopdurub saçlarına, qanıma cürət verəsən.

Necə üzr istəyim, ey gül ki, dilim lal olmuş,
Qorxuram əfv edəsən, bir də xəcalət verəsən.

Qul Nizamindi coşan, yoxsa dərin dəryadır,
Sarbanam, bəlkə vəfadan mənə xələt verəsən.

Sən ey yüz min cana dinclik verən can,
Ey bütün aləmin qibləsi olan!

Gəlirsən... baharsan, yoxsa laləzar,
Qoynunda bənövşə, süsən, ərğəvan.

Qarşında göyləri diz çökdürmüsən,
Ey sərvlər təkin bayraq qaldıran!

Açdın nəfəsinlə min-min qönçəni,
Ey neyşəkər kimi kəmər bağlayan!

Neçə ki, macal var, şadlan, qanadlan,
Ələ düşəcəkmi bir də bu dövran?!

Necə sürətlidir ömür köhləni,
Barı cilov çəkib üççə gün dayan.

Çox görmə qapını Nizamiyə sən,
Ey dodaq möhürü Yusifin olan!

Sənsən eşq tacı, gözəllər şahı,
Necə ki, aləmin şahıdır Arslan.

Arpa qədər də tabım yox, a buğdayı üzlü nigar!
Saman kimi saraltmışdır surətimi qanlı yaşlar.

O buğdayı cəmalına zinət verən sünbüllərin
Ən kiçiyi Sünbülədir – çiynindəki qızıl saçlar.

Qoşa zülfün mizanından arpa boyda müşk istərəm,
Könlün bir cüt tel yerinə bəlkə qızıl bir beyt umar.

Buğda dərdi çəkən kəndçi mənim qədər çəkibmi dərd?
Məqam çatmış, versin mənə gül ətrini gül dodaqlar.

Bircə xalın müşk içində gizli buğda danəsidi,
Dənmi umub düşüb tora mənim kimi yüz-yüz şikar?!

Tək buğdanı gözüm yedi, özüm heç nə dadmadım, ah,
Qapındakı cənnətindən mən kənaram, xeyli kənar.

Gecə-gündüz firqətindən tən böləndüm buğda kimi,
Nizaminin dərdi sənə arpaca da etmədi kar.

Ürəyimə yara vurdun öz əlinlə gülə-gülə,
Gözlərimdən qanlı yaşlar axıb gedir gilə-gilə.

Ürəyimin içindəsən, şəklin neçin bayırda bəs?
Tamarzınam, içərimdə olduğunu bilə-bilə.

Bu dünyadan mənim payım yalnız sənə vurğun ürək,
İki ürək birləşibsə, qıyma, dönmə bir qatilə.

Biz ki eşqin mizanında tən – dürüstük rəva görmə
Mənim eşqim çoxaldıqca, səninki az, yüngül gələ?

Bir vaxt məni əzizlərdin... De, bəs nədir bu düşmənlik?
Həmənki dost deyiləmmi? Ey nur, ey ilahi şölə!

Bütün könlü qırıqları məlhəminlə sağaldan sən,
Nizamiyə çatıb növbən... qəsd eləmə, insaf elə.

Ey uğurlu qasid, bir xəbər yetir:
Hardadır, necədir mənim nigarım?

Mənim canım üzük, ürəyim yetim,
Neynir, nə düşünür o işvəkarım?

Ceyran baxışları yarıyuxulu,
Mənim sünbül saçlım, çeşmi-xumarım!

Şəkər çeşməsinə təşnədir aləm,
Çəkilib küncünə bir laləzarın...

Mənim dost tutduğum düşmənimdir o,
Əzizim, istəklim, fəxrim, vüqarım!

Mən ki gecə-gündüz od içindəyəm,
Gülün üstündəmi bal çəkən arım?!

Qanımı içsə də, suçlu bilmərəm,
Əhdindən dönməkdə necədir yarım?

Ömründə bircə yol soruşmadı ki,
Hanı o divanəm, o qırıq tarım?

Dərdindən Nizami Yəquba döndü,
Bildimi Yusifim, dövlətim, varım?!

Səni bağda görən güllər pərdə çəkdi üzünə,
Reyhan zünnar bağlamağı rəva gördü özünə.

Xəcalətdən qızıl qandır qönçələrin niqabı,
Utanırlar, hüsnün salıb lalələri bu gunə.

Sən ətirli saçlarını qulac-qulac açanda,
Bənövşələr ismətindən köçüb getdi sürgünə.

Haray çəkən süsən-sünbül susdu, birdən lal oldu,
O ərğəvan cəmalından şölə düşdü hüsnünə.

Nərgiz sənin bazarından çoxdan çəkib gözünü,
Tamarzıdır, sözün varsa, yanaş şəbbu gülünə.

Nizamini dinləyəndə bülbül kəsdi cəh-cəhi,
Çırpdı özün dönə-dönə bu şerin hər sözünə.

Gözlərin gözlərimə xeyli tanış,
Gözümün nuru, gülüm, səndəndir.

Gəl, uduz hər şeyini təkcə mənə,
Fələyin fikri cığallıq, təzvir.

Darayım, gəl saçının bəndin açım,
Dügüm açmaq – ürək açmaq kimidir.

Barı beş gün mənim ol, ey süsənim,
Vaxt olur, ayrılıq illərcə çəkir.

Sorursan halımı... sorma, əziz dost,
Ürək dönmüş qızıl qana, əziz dost!

Mənəm Məcnun, sən ol Leylim, danışma,
Əlac eylə bu nalana, əziz dost!

Sənə çatmırmı fəryadım, qulaq ver...
Çatır fəryadım hər yana, əziz dost!

Eşitmişdim, əzizindir sevənlər,
Bəs ilk aşiq, əzəl sevda, əziz dost?!

Deyirdin bəs dayaq ollam, yıxılsan,
Yıxıldım... qanlı yarğana, əziz dost!

Sehr, cadu əsər qılmaz... Nizami
Yazır şerin... deyir sana, əziz dost!

Həyatdan kam alan fəxrəndə yoxmuş.
Qolu zəncirdən azad bəndə yoxmuş.

Gəlin bəxtim, bəzənsən də... düyün, toy
Bu doqquz aynalı aləmdə yoxmuş.

Həyat mənim gördüklərimmi? Heyhat,
İşıqdan bir əsər, bir zərrə yoxmuş.

İki dünya xəzinəymiş... nə fayda?
Xəzinədən çıxış bilmərrə yoxmuş.

Bu sonsuzluq – darısqaldan darısqal...
Göbək mişki hanı? Rayihə yoxmuş.

Tas altında bir əqrəbmiş bu dünya,
Nizami, gəzmə naçar... heç nə yoxmuş.

Könlüm evi xarab olur, canım alan o can hanı?
Oğru çalır xəzinəni, keşikçi, pasiban hanı?

Çıxıb gedib də karivan, mən geridə, mən yarıcan...
Hardadı köhlənim mənim, de, başçı, sariban hanı?

Mən qapıda bütün gecə, gah yuxulu, gah da oyaq...
Yolçuyam, umduğum ruzu, sümük ya üstüxan hanı?

Nizami, sən ki tapmısan bundan əziz bir aləmi,
Yol almısan o aləmə, bəs azuqə-filan hanı?

Sənin ətirli tellərin kəsib yolu, sağı, solu.
Qəmzələrin can almada... könlüm ələm, sitəm dolu.

Kim ki üzün görür sənin, yolunda can verir sənin.
Kim ki sevir, ömür boyu... boynuna çatmayır qolu.

Sadiqi-sübhə yalvarıb fatihə vermək adətim:
– Gəlməyəsən yaman gözə, ey aləmi ülvi, ulu!

Yaraşmasam da, gəl, uyuş, odum sənin, külüm sənin.
Göz yaşımı qurut, gülüm, baxım sənə gözüm dolu.

Səninlə ilk oyundaca, canımı qoydum ortaya,
Cığallama, uduzmuşam, hakim özün – eşqin olub.

Möcüzəkar İsa kimi lələ dönüb ləbin yenə,
Nizami başqa möcüzə – quldu sənə, vəfa qulu.

Dərd başdan aşıb da canə yetdi,
Naləm odu asimanə yetdi.

Çəksən də ətək, mən üzmərəm əl,
Qəm neştəri üstüxanə yetdi.

Gizlətmək olarmı heç cahandan,
Sirrim o biri cahanə yetdi.

Düşdü bu mələr könül dalınca,
Yalnız ahı karivanə yetdi.

– Gözlə, səninəm, döz, ey Nizami,
Vəd etdin... ömür son anə yetdi.

Öylə şirin söz de ki, ta şəkər ərzan ola,
Öylə bir əldən yapış, ta sitəm asan ola.

Qorx ki, vüsalın bizə qismət ola onda ki,
Vədə yetə, iş bitə, yer bizə yorğan ola.

Qayğını kimlər görər? Yardım uman bəndələr
Kim ki verər tez cəza, gec də peşiman olar.

Ey pəri, sən bir gecə, gəl ki, Nizami gülə,
Gəl ki, qarışqa evi mülki-Süleyman ola.

Xoşbəxt yaşa, qəm çəkməyə dəyməz.
Dünyaya fəğan tökməyə dəyməz.

Çərxin çəkisi bəlkə bir arpa,
Ədli sənin heç zülmünə dəyməz.

Sübhün soyuğunda mənim olsan,
Yay gündüzü qış sübhünə dəyməz.

Azca dəyəri bəlkə də var? Yox!
Düzgün cavabım könlünə dəyməz.

Gör sənin ucbatından nələr gəldi başıma,
Özüm öldüm, eşqimsə məğrur çıxdı qarşına.

Getdin... bircə an belə dönüb baxmadın geri,
Ey həmişə əhdinə dönük çıxan aşina!

Düz gəlmirsən mənimlə, səbəb gözəlliyindir.
Gözəllərin adəti – uymamaq tay-tuşuna.

Sənin eşqində necə səbr eləsin Nizami?
Yanar qəlbi dönübdür bir Səməndər quşuna.

Qəm yemə, qəm əhlinin imdadına canan çatar.
Dosta yardım, bərk ayaqda mehriban dostdan çatar.

Kim səadət istəsə, göz yummasın qoy sübhədək,
Yatsa – kordu, ağ günə yalnız ayıq insan çatar.

Sən hümasan... xırmanı qoy qarğalar eşsin, nə qəm.
Sən mətinsən, umma... yalnız xəstəyə dərman çatar.

Burda şahlar çarpışır, oxlar yağır, gözlə gözün,
Orda bayram əhlinə kişmiş, noğul, reyhan çatar.

Bal yeyən milçəkdi, bəs neçin yanan pərvanədir?
Oğru qalmış, doğruya haqsız cəza lapdan çatar.

Şah ova çıxmış, saray itsaxlayan hökmündədi,
İncimə, darvazaya it dartınar, səgban çatar.

Aşiq – əsrik, aqil – azaddır, ayıq bəs neyləsin?
Ona da yalnız sabah növbət yetər, imkan çatar.

Ey Nizami, göz yumub dünyaya dövlətdən çək əl,
İş sənin tək işsizə bambaşqa dünyadan çatar.

Allah, Allah, bax bu cür dilbər mənim olsun gərək.
Zülmətə atəş saçan gövhər mənim olsun gərək!

Aləmi odlandırır şəkkər ləbinlə ud xalın,
Udla bir şəkkər səpən məcmər mənim olsun gərək.

Duzda dad, ləzzət olar, amma şirinlik, heyf, yox!
Həm şirin, həm duzlu bir şəkkər mənim olsun gərək.

Hazıram nuş etməyə cüt aləmi bir badədə,
Saqim ol ki, sən verən sağər mənim olsun gərək.

Müşk zülfün ətrini saçmaqdadır dünyalara,
Ah, bu cür xoş rayihə, ənbər mənim olsun gərək!

Zülfünə quldur Nizami, nə deyir zülfün ucu:
"Bax bu cür sadiq nökər, çakər mənim olsun gərək!".

A xidmət etdiyim gözəl, qazancım intizar olur.
Bu zəhmətim, qızılgülüm neçin gözündə xar olur?

Kəsmə mənimlə ülfəti, düşmənə vermə fürsəti,
Dost üzünu xəcil görən dost üzü şərmsar olur.

Mənim bir az qanım qara, sənin bir az üzün qara.
Rəngimi gör, halım soruş... vəhs işin aşikar olur.

Mən gəlirəm bir az yaxın... uzaqlaşırsan amma sən.
Ömür keçir, işin-gücün təkcə qürur, vüqar olur.

Qanımla oynama, gülüm, çiçəkləyər tumurcuğun,
Şəkərlə duz ki birləşir, xoştəhər abidar olur.

Bu gecə yatmaq nədir? Ləzzət çəkək ta sübhədək,
Yatmağa var başqa gün, başqa döşək ta sübhədək.

Gah gözüm üstündə əyləş, gah sığın, sin canıma.
Bağrımın başında ol, ülfətləşək ta sübhədək.

Sən badamgöz bir gözəl, şəkkər dodaqlı bir mələk,
Məzəmiz şəkkər, badam... mey nuş edək ta sübhədək.

Başıma çox döymüşəm hicrində, ey gül, mən dünən,
Bu gecə vəslin başımda bir çələng ta sübhədək.

Əllərim, canım sənin, mərci apar, ey nazənin!
Ud məni nərddə, oxu, şənlən görək ta sübhədək.

Zülfünü tövbən kimi tulla, öpüşlər saç mənə,
Tövbəni zülfün kimi əy, şəhd içək ta sübhədək.

Sən Nizami şerini dinlə, qulaq halqası et,
Gəl qapı halqasını tərpətməyək ta sübhədək.

Tutdu məni eşqin, sevda məni çəkdi,
Hər sirrimi açdım, səhra məni çəkdi.

Verdin də qaşından bir fitnə qılıncı,
Meydan məni tapdı, qovğa məni çəkdi.

Göstərmədin ülfət, şəfqət, ya məhəbbət,
Sandım ki, koram, kor... röya məni çəkdi.

Üstümdə sən Ay-Gün, al qanımı tökdun,
Sel gəldi də... gördün, tənha məni çəkdi.

Nəqd vəslini görməm, nisyə umar ümmid,
Aldın günüm əldən, fərda məni çəkdi.

Yaş tökdü Nizami o qədər gözündən,
Bac istədi dürrü, dərya məni çəkdi.

Alım səndən ürəyimi... duşünürəm dönə-dönə,
Heyhat, ürək əldən uçur, gedib çatır bir də sənə.

Biz çörəklə duz kimiyik, can-ciyərik, bəlkə birik
Başqasına könül versəm, yeni bir can gərək mənə.

Qurbanınam, çatdır məni özün qurban bayramına,
Son nəfəsdə bir fal açım baxa-baxa gözlərinə.

Sənin vüsal məçlisində dadarammı birçə noğul,
Həyat adlı xəzinədən üzülməmiş bu dürdanə?

Ürəyinə tapşır, gülüm, qoy içməsin ürək qanı,
Yoxsa sənin yolun dönər ürəyimdən axan qanə.

Əlim gəlməz qılıncına qılınc çalam... öz qulunam,
Əmr eləsən daşıyaram... qanad ollam kəcavənə.

Gözüm qan-yaş töküb silər Nizaminin izini də
Qıyarammı bu yollarda tozum qona ay çöhrənə?

Yoxdu xəzinəm ki, saçım üstünə.
Al bu quru canımı, qurban sənə!

Hansı kələklə səni mən ovlayım?
Sök canımı, tök qanımı, ey sənəm.

Eylə qəbul, hər nə varımdır, verim,
Torpağına, millətinə, mülkünə.

Hər iki dünyanı ucuz saymasan,
Qurban edim çul daşıyan bəndənə.

Gəl ki, tozun da gözümə sürmədir,
Gəl ki, Nizami can atır sürmənə.

Baş apar, nazlan ki, mən nazın çəkim.
Hər qadan gəlsin mənə, ey göyçəyim!

Məstəm eşqindən, o rövşən badədən,
Qoy dözüm, ol işrətin altın çəkim.

Sən zəlillər tək məni etmə kənar,
Qoy səni ağuşuma coşğun çəkim.

Öldürür rüzgar məni cövrünlə, bax
Gündə min bir zülm edir, hansın çəkim?

Vay o gündən ki, ümidim məhv ola,
İntizarı boş, əbəs, məhzun çəkim!

Mən – Nizami, bülbüləm gülzarına,
İnsaf et, gül dərmədən cövrün çəkim?

Ey sənəm, gözün fədası, bizə bir gecə səfa qıl,
O şirin vüsalın ilə xəstəyə bir az şəfa qıl!

Bircə istəyim budur ki, səni bir xəlvət öpüm mən,
Zülfünə canım da qurban, bu payı mənə rəva qıl.

Fağıra, qaydadı, şahlar azacıq nəvaziş eylər,
Ey şahım, məni qapında lütf elə, kölə, gəda qıl!

Kəmərin çəkib Nizami, sənə bir qul olmaq əhdi,
Tikanı çıxar ürəkdən... az ona əzab, cəfa qıl!

Söndür şamı, pərvanə tez gəldi çırağı-çanımız,
Qan ağla, ey gülzarımız, güldü güli-xəndanımız.

Könlüm olub meydan sənə, al canımı, qurban sənə,
Yetdi, ey Hindistan sənə, fəğfuri-Türküstanımız.

Cənnətdə yox, mislinlə sən addımlayan bir sərvsən,
Mən bəndəyəm, sən hakimsən, fərman ver, ey sultanımız!

Nurlar saçan hüsnün çıraq, yandı pəri-pərvanə, bax
Biz təşnə, sən büllur bulaq, bir cam ver, ey loğmanımız!

Lütf et bir az, ey nazənin, Nizamilə ol həmnişin,
"Sən mənimsən, mən də sənin!" – gör nə söylər ceyranımız.

Ey gülü-xəndanımız, sərvi-xuramanımız,
Mən səninəm, sən kimin? Ey təzə reyhanımız.

Can sənə təslim olub, ruh dolanır başına,
Hər nə umursansa um, ey ruh ilə canımız!

Kəssə də dəstim qılınc, zülfün ucun verməərəm,
Ta ki quca boynumu yar əli – mərcanımız.

Təşnə mənəm, çeşmə sən, söndür ürək yanğımı,
Bal dodağındır sənin çeşmeyi-heyvanımız.

Can de Nizamiyə gəl, ta ki ucaltsın bizi
Ən ulu şah Axsitan – sahibi divanımız.

Mən öz gəncliyimi sənə verdim, yar,
Könlümdə saxlanır açdığın bazar.

O qənd dodağının al yaqutunu
Qan-yaş tökən gözüm əks edər aşkar.

Apardı ömrümü şirin sözlərin,
Sözünün üstündə durmayan nigar.

Fəryad, o ətirli tellər əlindən!
Sanki ağ üzündə nar çiçəyi var.

Gecələr sübhəcən hönkürən ürək
Gələr, astananı öpər, qucaqlar.

Qanıma susayıb bir cüt nərgizin,
Haray, ey laləzar, haray, ey bahar!

Sən, a bütün türkləri hindu qılan,
Kaş olasan ovçu gözündən nihan.

Cismimi qurban demişəm telbətel
Zülfünün hər bir telinə yanbayan.

Varmı halım, əl vurasan, tab edim,
Ey bu yazıq canıma min ox vuran!

Mən ki cigər qanımı etdim ruzu,
Ey qanımı mey tək içib kam alan!

Sən gecələr dinc uyuyan bir mələk,
Mən bir evin dövrəsinə fırlanan.

Qoy qapanım, gül qədəmin bir qucum,
Çoxmu uzaqdan baxacam bağrıqan?!

Bal dodağından öpərəm, qorxmasam,
Kirpiyin oxdur, qaşın hazır kaman.

Çoxdu sevən... amma səninçün, gülüm,
Bircə Nizamindi göyə yalvaran.

Gözlərinə and olsun, məndə yüz nişanən var.
Günüm zülfündən qara, səbrim ağzın kimi dar.

Ayaqlarım getmir ki, üzəngidən yapışım,
Əlim gəlmir, atının cilovunu çəkim, yar!

Səninlə bir yastığa baş qoymağım yadında...
Başım dizim üstündə, ya küçəndə biqərar...

Ürəyinə salma ki, biganələr yanında
Vəfa xəzinəmizi açıb qılaram aşkar.

Ürəyimi verirəm, ziyandırsa, heç alma,
Vüsal haqqı verməyə candan artıq nəyim var?

– Gələrəm! – söylədin sən, – cəsur ol, ey Nizami,
Xoşbəxtəm ki, bu sözü dedi o gül dodaqlar.

Sən – bütün qızlardakı hüsnü tamam
Talayıb hüsnündə cəm etmiş gözəl!

Asta get... sən uyğulu... nazlanma çox,
Ey ayaq üstündəcə yatmış gözəl!

Hökm edib: "Get, özünü öldür!" dedin,
Qətl, qatillik yolu tutmuş gözəl.

Dəydi kirpik oxların... bal tək yedim,
Ox ucu ey zəqquma batmış gözəl!

Qul Nizamin bir dəri, bir də sümük...
Qanım içmiş, əhdinə çatmış gözəl!

Bəlkə bir ləhzəni qurban edəsən,
Bu yanıq könlümə dərman edəsən.

Qanlı yaşlar məni onsuz da boğur,
Qorxuram – hicr ilə tufan edəsən.

Ürək əldən gedib... ondan vaz keç,
Bəlkə sən ruhuma imkan edəsən.

Damğa vur, tökmə qanım, çox zəifəm,
Dəyməz ol rəncə ki, al qan edəsən.

Həsrətəm ləblərinin halvasına,
Hünərin varmı ki, mehman edəsən?

Möhrünü basdı Nizami ləbinə,
Məni möhrünlə Süleyman edəsən.

Çaldı yenə qəlbimi bir gözəlin gözləri,
Tərk eləyir canımı ruhum – onun şəhpəri.

Gül dodağın gülməsi balmı qatar qaymağa,
Püstən utandırmada şərbət ilə şəkkəri.

Kirpiyini bir də çal, qəşş eləsin qoy mələk,
Zülfünü at çiyninə, nalə qoparsın pəri.

Pozdu telin islamın rövnəqini, ey gözəl,
Sən var ikən yox lüzum biz qınayaq kafəri.

Ah, belə bir hüsn ilə çıxsan, inan, çöllərə,
Gün vurular hüsnünə, Ay da olar müştəri.

Ağlımı başdan edib açma o zəncirləri,
Çin-çin edib zülfünü saçma ətir-ənbəri.

Versə ləbin azca mey, nalə çəkər çəngü-ney,
Ruhum olar meypərəst, gözlər – onun sağəri.

Ah, o cəmalınla sən, lütf cəlalınla sən,
Könlüm olar bəxtəvər, bir dəfə baxsan bəri.

Hicrin ilə xəstədir bəndə Nizamin sənin,
Əmrinə hazır durub, şad elə bir çakəri.

Gül surətə nəzər sal, ta gör də laləzarı,
Qısqandı, lalə yandı, köksündə bitdi xarı.

Tər qönçənin önündə nə durmusan çəməndə?
Yarın önündə dur ki, tikanlıdır baharı.

Bir cüt şəkər ləbindən vaxta ki, ləl umarsan,
"Çıx get" işarəsilə göstərməzmi kənarı?

Ömrüm boyu qəmindən könlüm özün itirmiş,
Yüz il baxsan dəyişməz həyatımın qərarı.

Nizami tək bir addım özündən öndə get ki,
Hicranda da vüsal tap, yandır qəmi, qubarı.

* * *

Apardın könlümü, canım da səndə,
Gülüm, başqa bazar açdınmı gendə?

Səni mən tək sevən varmı, fikirləş
Sevən bircə, uman çox yan-yörəndə.

Üzün tər gül, saçın mişkin, canın saf,
Neçin bəs qalmısan dərdlər selində?

Nizamini vüsalınla sevindir,
Düzgün bəxti açılsın qoy əlində.

Vermərəm can sənə mən, can alan olsan da, gülüm,
Çün alıb canı... yaşarsan təzə bir canda, gülüm.

Gərçi mən acizəm, amma sən əzazil olma,
Elə rəftar et... özünlə məni bir san da, gülüm!

Mən ki Cəmşid deyiləm, busənə bir qəsr verim,
Bir mənəm, bir də canım... almasan, alsan da, gülüm.

Sən keçən yollara mən göz gülabı səpmədəyəm,
Sən gedib, çör-çöpə öz sayəni salsan da, gülüm.

Səni göz nurum, həyat məqsədim, ömrüm bilirəm,
Üzü ay, gün şəfəqi, gül dodağı qənd, a gülüm!

Məni bir şəm ilə öldürmə, de, pərvanəmiyəm?
At qılıncı ki, mən atdım yerə qalxan da, gülüm!

Qul Nizami sənə dünya kimi açdı qucağın,
Bir öpüş... “Yox” deyibən etmə aman, and, a gülüm!

Qoşuldun mərdlərə, oldunsa mərdan,
Yetər, əl çək təkəbbürdən, vüqardan.

İçib şövqün meyin ər süfrəsindən
Tamam ayrıl bu varlıqdan, bu vardan.

Yolunda gözləmə heç kəsdən imdad,
Umub küssən, qapın bir gün qaparsan.

İnan, dostdan mədəd ummaq – zülümdür,
Özün dosta mədəd qıl, gər bacarsan.

Basıb keçmə qarışqanı, amandır,
Hər Allah bəndəsin dost bil, hayan san.

Tamam heçsən, yüz il qan-yaş da töksən,
Tamam zaysan, əgər bir qəlbi qırsan.

Bütü, bütxanəni qır, ey Nizami,
Çətin iş qeyrətinlə olsun asan.

Mənim dərdim böyük dastan... oxu, dərmanım ol, ey dost!
Canım yarə, günüm qarə, sökülmüş danım ol, ey dost!

Önündə mən kəmərbəstə, nə əmr etsən, gözüm üstə.
Nigarımsan, canım istə, qulam, sultanım ol, ey dost.

Səbuhim ol, salıb yadə... qanımdan dolu al badə,
Desəm: "Nəğmə oxu bir də!" Ahım, əfqanım ol, ey dost!

Gələr bayram, vüsal qıysan... De harda qaldı bəs qurban?
Bir az rəhm eylə, ver fərman, de ki, "Qurbanım ol!", ey dost!

Məgər hicran çəkən yarı sevindirməzmi dildarı?
Yolumdan yığ tikanları... gülüm, reyhanım ol, ey dost!

Nizami bir ürək... kövrək... arar yarı tamaşa tək.
Barı bir dəm gəlib baş çək, mehim, mehmanım ol, ey dost!

Həsrətəm camalına, ey dost, harda qalmısan?
Mən qulunam, ey şahım, məni məndən almısan.

Gözlərin şahiddi ki, hüsnün yağıdır mənə,
İddiaçı, şahid də, hakim də sənsən, ey can!

Qısqanıram, baxmasın, ayna da vurğun sənə,
Görməsin camalını sevən qəlbi olmayan.

Sən müşksən, sirrini səba saxlaya bilməz,
Ətrin tutar aləmi tellərini darasan.

Sən keçdiyin yollara qan-yaş tökür Nizami
Yolun ağ olsun, özün daim xoşbəxt, kamiran.

Hər cilvəni Tanrım sənə əlan
Sanki özü göndərib səmadan.

Sev, oxşa məni öpgülərinlə,
Hər busə – murad, aşiqə ehsan.

– Qəlbim,– dedim, – hardadır? O güldü:
– Orda ki yeri həmişə pünhan.

Qanımla əlin yumaqmı istər?
Qan-yaş tökürəm, yusun da canan.

Nə qəlbi gözəl, nə xülqi əla,
Olsunmu ona Nizami qurban?!

Mümkünmü deyim nəvazişindən,
Əhvalını sorsa Qızıl Arslan?!

Hər gecə umar könul ki, bu gecə gələr baharım,
Bu qərara gəlməsə yar, kəsilər mənim qərarım.

Başqa gözlərə baxanda gözü nərgizə dönən yar,
Nə üçün tikan olur bəs, bizə qəmzən, ey vüqarım!

Neçə düşmənim gülür ki, bizə yad ona yaxınsan,
Sifətim yanır həyadan, necə yarsan, ey qubarım!

Mənə düşmən olsa dünya, yenə qorxmaram inan heç,
Təki ərk ilə bir axşam qapımı qıra nigarım.

Necə sən hümasan, ey can, ələ duşməyin nə müşkül,
Nə gözə şikar olursan, nə də qəlbə, ey xumarım.

Hər sevən sanır onunsan, leyk sən Axistanınsan.
Get, ona yaxınlaş, ey can, a Nizamidən kənarım.

Sən görən deyiləm mən, sənsə elə o ləlsən.
Mənim gəncliyim ötdü, sən bir az da gözəlsən.

Əmrinlə yox, təskin et məni öz insafınla.
Mən istəyən qədər yox, baçardığın qədər sən.

Sınıxmışam, eləmi? Necə sınmasın ürək?
Canım elə o candır, cismim – necə görmüsən.

Sən – Xəlilisən, mən – od, axı neçin sönməyim?
Mən ölürəm, sən yaşa! Ətir saç, ey gülbədən.

Sənin ay camalını görüm deyə bircə gün,
Musa tək ömrüm boyu çobanlıq edərəm mən.

Bağçamızda nə varsa, xəzan aldı, apardı,
Sənin kimi bahardan mən təravət umarkən.

Nizami kəmər çəkib dayanmış xidmətində,
İki dünya günəşi alnında parlar, əhsən!

Qəmin kəm, ey gözəl, vardır mənim tək köhnə qəmxarın.
Sənə, vallah, münasibdir bu simsarın, vəfadarın.

Halım sorma, bir az rəhm et, qalım dərdimlə qoy yalqız.
Bu cövr içrə adım çəkmə, inan, xoşdur bu rəftarın.

Seç hansı rəngi xoşlarsan, seçim mən də həmən rəngi,
Tərəfdarı olum mən də ya təsbihin, ya zünnarın.

Səni daim sevən dosta neçin düşmən kimi baxdın,
Sən ar bildin bizə mehri... Səninlə fəxr edir yarın.

Bu dərdi mən asan çəksəm, çəkərsən bil sən həm asan.
Çətin çəksəm, düşər bərkə mənim karım, sənin karın.

Nizami hər zaman dostu əzizlər... sənsə xar etdin.
Mən aşiq, sən də məşuqəm... qalar yadda bu kirdarın.

Min sevincə dəyişmərəm uğrundakı bircə qəmi,
O qəm mənə bəxş eləyir ölməz, itməz bir aləmi.

Hər bəzmdən, hər nəşədən dadlı imiş cövrün sənin,
Qəhrin də xoş mehrin kimi, ey könlümün cəhənnəmi!

Yalnız sənin qulunam mən, heyif qulluq bacarmıram,
Can məlhəmim əlindədir, nə qəm, qıyma o məlhəmi.

Gülümsədi qoşa püstə, dedin: – Məndən vüsal istə.
İstəyimmi? Heç bilmirəm bir vəslinə dəyərəmmi?

Mənim könlüm səndən savay heç bir kəsi istəməz, yox,
Sən kiməsə bənzəmirsən, sənə kimsə bənzəyərmi?

Günüm batdı, gəl, ay bədrim, bir anlıq gəl, amanım ol!
Sən eşqimsən, uzaq gəzmə, evim ol, aşiyanım ol!

Kəsil həmdəm, solub rəngim sinəmdən sil pası, jəngi,
A dərdim qaynağı, dərman, güman sənsən, gümanım ol!

Ləbin kövsər – bulaqvarı... həyatın ilk səbəbkarı,
Dişimdə tutmuşam canım, gəl, ey canım, həyanım ol.

Gözün qurbanı, hirslənmə, sevinsəm, gül, kədərlənmə.
Qanımla oynama, cana, canımla oyna, canım ol.

De, yetməzmi, vurub atəş, durub gendə, oda baxdın?
Tapaq gülşən, yapaq şənlik, suda qönçəm, fidanım ol.

Qəmər saçlım, hilal qaşlım, Ayın bədri, gülün çətri!
Qulun qulluqda amadə, buyur, gəl, hökmranım ol.

Yaşıl tağım, İrəm bağım, uca sərvim, süsən bərgim,
Nizami dərdinə son qoy, gülüstanım, cahanım ol!

Gəncliyimi sənə verdim, bu möhlətdən şirinsənmiş.
Nə cür ölüm qarşında mən, bu fürsətdən şirinsənmiş.

Gözlərimdə yaş olsan da, işıq alır ürək səndən,
Can möhnətim, bunu bil ki, sən işrətdən şirinsənmiş.

Hardan tapım incə sözü, nə cür verim qiymətini?
Sən daddığım, dadmadığım hər nemətdən şirinsənmiş.

Savaşın da, barışın da yağ-bal dadır damağımda,
Mehrin qədər qəhrin də xoş... hər cəhətdən şirinsənmiş.

Nizaminin həyat dürrü sənin bir vəslinə qurban,
Hər nə versəm ucuz olar, hər qiymətdən şirinsənmiş.

Sığar qəlbə, qəmin dünyaya sığmaz,
Məhəbbət – dağ seli... məcraya sığmaz.

Gözüm qan-yaş... soruş hardan sızır qan?
Yığışsa çay olar, dəryaya sığmaz.

Gülüm, gülmə... dar ağzına bir öpgüm,
Şirin busəm sığar bəlkə, ya sığmaz.

Vüsal ümidi bir teldir – çox incə,
Vüsal eşqi sözə, misraya sığmaz.

Dodaq mücrün mənə bir ləl versə,
Günəş şehdə güli-rənaya sığmaz.

Nədir əhdin? Canım almaq? Bu gün al!
Sabah gecdir. Sabah sevdaya sığmaz.

Harda ki adın çəkildi bir dəm,
Xirqəm, bədənim alışdı birdən.

Satdın özünü bazarda... aldım,
Qapdım səni aləmin əlindən.

Umdum ki, vəfa qılarsan... heyhat,
Döndün... dönüşə inanmadım mən.

Vurdun, qanadım qırıldı bir cüt,
Uçmur, sən üçün gedirdi göynən.

Atdım neçə dostumu, a zalım,
Ta atmayasan Nizamini sən.

Ey əhdimizə ən uca ünvan,
Neçin bizə sən xilaf çıxırsan?

Zəmzəm bulağım, yanıb kül olduq,
Bir damla da qıymadın suyundan.

Ayrılma bu gün... axır ki, bir gün
Onsuz da gəlir zəruri hicran.

Vəslin ki sonu fəğandı daim,
Kaş olmaya heç bu əhdü-peyman.

Yüz sərvətinin birin də qıymaz,
Qıymaz gözəlim, vəfa umur can.

Bir gün canıma gərək qıyam ki,
Qəbrim qızına sənin ahından.

Heç vaxt dönəməz Nizami səndən,
Bezməz bu qədər əzablarından.

Mən kiməm ki, söyləyim: eşqim mənə mehman olub.
Dəm vurum ki, içmişik and, əhd olub, peyman olub.

Öz xudavənd hümmətilə mən qulu xoşbəxt edib,
Bəzminə bəxş etdiyim nemət çörək yox, can olub.

Nur cəmalından doğubdur gecələr bayram günü,
Bayrama qurban gərək... canım ona qurban olub.

Ləbi əlçatmaz... düşüb gül qədəmindən öpmüşəm,
Bircə busəm yüz ilin can dərdinə dərman olub.

Açmışam dərdim-sərim, xoşbəxt gülüm xoş dinləyib,
Dizimə köksün qoyub... dəstim ona yorğan olub.

Sübh – naməhrəm gəlib də... eyləyib eyşim haram,
O gedərkən yığdığım həsrət, giley, hicran olub.

"Ey Nizami, əlvida, mən bir daha görməm səni!"
O gülüb getmiş... mənim ağlar gözüm giryan olub.

Harda ki sən varsan, qəmər gərəkməz.
Kimin olsan, ona şəkər gərəkməz.

Başının üstündə Ay kimi dursan,
Dünyada kimsəyə səhər gərəkməz.

Mənim kabab olmuş bir ürəyim var,
Daha can gərəkməz, cigər gərəkməz.

Üz göstər... Bu ümid bəsimdir, gülüm,
Baxmaram Günəşə, göylər gərəkməz.

Axı əvvəl-axır görünəcəksən...
Nə lazım, bu qədər dərd-sər gərəkməz.

Sən ki söz vermişdin, neçin gəlmədin,
Gəlmədin... başqa bir kədər gərəkməz.

Sənin xidmətində qul Nizamiyə
Zülfündən savayı, kəmər gərəkməz.

Təəssüf, min təəssüf ki, təkəm, dildarə möhtacam.
Bu qəmlərdən xilas et gəl məni... qəmxarə möhtacam.

Yazıq könlüm sədaqətdən xəcil oldu, zəlil oldu,
Vəfa qıldım... Hanı əhli-vəfa, bir yarə möhtacam.

Könül aram tapar yalnız dürüst ülfətlə, söhbətlə,
Əgər görsən, nişan ver sən, şirin göftarə möhtacam.

Mənim ömrüm, günüm qurban vəfa ətri saçan dosta,
Hanı? Gəlsin, verim canım... yanım odlarə, möhtacam.

Gecə-gündüz çıraq əldə... gəzib bulmam da bir həmdəm,
Hanı həmdərd, bir həmsöhbət... qırıq bir tarə möhtacam.

Kimin gülşəndə varsa bir gülü... bəlkə gülər könlü,
Gəl, ağla qəbrim üstündə, tikana, xarə möhtacam.

Nizami, Gəncəni tərk et, apar ver, şeri Şirvanə,
Sözün qədrin bilən sərrafə, tacidarə möhtacam.

Yüz Yusifi Kənani
Eşqin ulu qurbanı.
Eşqin ulu qurbanı
Yüz Yusifi Kənani.

Yaqut ilə mərcanı
Saçdı ləbinin ləli.
Saçdi ləbinin ləli
Yaqut ilə mərcanı.

Hüsnün, həvəsin canı
Sənsən bizim aləmdə.
Sənsən bizim aləmdə
Hüsnün, həvəsin canı.

Alt-üst elə dünyanı
Bir yol qıya baxmaqla.
Bir yol qıya baxmaqla
Alt-üst elə dünyanı.

Sat qəmzəni pünhani,
Can al da Nizamidən.
Can al da Nizamidən,
Sat qəmzəni pünhani.

Saçların dağnıqmıdır, aləmmi, ya karım mənim?
Qönçədən ağzınmı dar, ya qəlbi-qəmxarım mənim?

Gecə, ya qəlbimmidir, halımmı, ya xalın qara?
Bal şirin, ya ləblərin, ya şəhdi-gövtarım mənim?

Ayla Gündür nur saçan, fikrimmi, ya hüsnün sənin?
Tez dönən bəxtimmi, ya əhdin, ya rüzgarım mənim?

Əyilən vədənmidir, rəyinmidir, yoxsa belim?
Sözlərin boşdur, güləkmi, yoxsa əşarım mənim?

Pərvin – ülkər yaxşımı, dürrü-sədəf, ya dişlərin,
Qamətinmi, sərvmi düzdür, ya əfkarım mənim?

İsmətin, səbrimmi kəm, yoxsa gözəllərdə kərəm?
De, sənin lütfünmü çox, ya dərdim, azarım mənim?

De, fələk çox qan tökür, sultan qılıncı, ya gözüm?
Nazü qəmzəndir iti, xəncər, ya bazarım mənim?

Qəlb açan vəslinmidir, yoxsa mənim şerim, sözüm,
Can yaxan hicrinmidir, yoxsa bu ah-zarım mənim?

Mən – fikirlər ustadıyam, fəzilətim – bir ümmandır.
Zamanlara, məkanlara hökm etməyim səmadandır.

Nəfəsimin ildırımı uca səsli zəngə bənzər,
Bayraqlaşan qələmimin sancıldığı yer – cahandır.

Keyqubadın şah tacından çox ucadır qayəm mənim,
Cah-cəlalım, şan-şöhrətim Gurxan geyən qəbadandır.

Mən – kainat məşəliyəm, mən dördüncü qatda – Günəş,
Mən – ikinci İsayam ki, xoş nəfəsim bir loğmandır.

Söz mülkündə hakim mənəm. Kim, söyləyin mənim təkin
Sahib – qiran qüdrətilə zəfər qapısı açandır?!

Kəşfiyyatçı əql ordumu göndərirəm ön cəbhəyə,
Ədəb fəzlim ayıq-sayıq... silahlanmış pasibandır.

Qüdrət, cürət səxavətdən, söz də məndən yaranmışdır,
Tər-təravət cavanlıqdan, hunər məndən bir nişandır.

Birərğənun sədasıdır qəzəllərim qulaqlarda,
Lalə rəngli mey sayağı sözlərim zövq oxşayandır.

Yemlədiyim ulduzlara mənəm verən ilk təkanı,
Pak dirilik suyu mənəm, onlar kasa, ya fincandır.

Əbəs yerə dəf çalmaram, nə vaxt çalsam, toy başlanar.
Xütbə üçün nəğmə desəm, sanarlar ki, qəzəlxandır.

Təbiətin, təfəkkürün təməlidir saçmalarım,
Piyaləmin xıltı – mədən, bitkilərə nəfəs candır.

Tazə bəhrə kimi gülən mənim cəsur üslubumun
Yanında hər bir yenilik xəzəl kimi saralandır.

Hər bədihəm, hər müəmmam yüz-yuz qəlbi fəth eləyir,
Min-min canı satın alan eyhamlarım bir dastandır.

Görsə incə, pak xəttimi şərəf tapar İbn Müqlə,
Şerimdəki cadulara İbn Hani də heyrandır.

Mən – şeriyyət səmasında ləkəsiz bir Ay bədriyəm,
Mirvaridə illət olur... məndən uzaq illət andır.

Umsan Misir bələsanı, məni dinlə, baldı nitqim,
Xurma kimi dadlı, şirin, qaymaq tutan bir lisandır.

Göy sirrini nurlandıran mənim məşəl ürəyimdə
Əbədi bir kitabım var, kamillikdə o, Qurandır.

Zənd oxuyan möbidlərin nəfəsini kəsər nəğməm,
O nəğmə ki, zəbur təki dəhşət saçan bir tufandır...

Hər sözümün qüdrətilə min-min ürək çiçəklənir,
Dodaqlarım güz fəslində yaz nəfəsli tər reyhandır.

Bu şənliklər diyarında səslənməsə nəğmələrim,
Kim bilər ki, müğənnilər muğ meyi tək qəlb açandır?!

Fəxr edirəm sənətimlə. Deyin, necə fəxr etməyim,
Mətləblərim bunca incə, şerim bu qədər rəvandır!

Hey çəkilən, hey qabaran bir ümmanın nəfəsiyəm,
Cəzri dürr axtaran kəndir, məddi bəlkə nərdivandır.

Çəkdiyim hər isti nəfəs dönür eşqə, nəvazişə,
Bir də gördün o, təbimlə tüstülənən bir mərcandır.

Sədəf kimi halalxoram, gövhər kimi halalzadə.
İki haramzadəninsə mənə uddurduğu qandır.

Atasından xəbərsizdir xəbis. Mənim ulduzumsa
Yüksək Yəmən ulduzu tək bicbalanı batırandır.

Nizaminin söz köhləni ildırımdır deyənlər var,
Dərd dağının altında, de, görünərmi məgər cındır.

Ah, bu qədər öyünməklə həm xəciləm, həm peşiman.
Öz-özünü mədh eləyən içəridən natəvandır.

Yetər, bağla xəzinəni, aç incilər sandığını.
Söz incisi fazillərə ən qiymətli ərməğandır.

## MƏTLƏNİN DAVAMI

Kisədə bir muncuq da yox... mən neynirəm dürr saçmağı?
Boşdur cibim... kimə lazım sözüm ləldir, bədəxşandır?!

Bir özünsən, bir də könlün. Mey bilib iç göz yaşını,
Sübhə kimi öz qəlbinlə ver baş-başa, döz, amandır!

Halallığım ucbatından mən çəkəni, de, kim çəkib?
Onun çiyni, kürəkləri, mənim qəlbim qara-qançır!

Könül, din də əldən gedib, yenə şöhrət həvəsliyəm,
Baş papaqsız, ayaq yalın... ancaq ruhum pəhləvandır.

Yer dibindən göy fövqunə can atmağım bəlkə hədər,
Lövbər ata bilməyənə yelkən açmaq qadağandır.

Mən nə mahir hiyləgərəm, nə də nadir bir oyunbaz,
Ki, görələr göz yaşım al, rəngim-ruhum zəfərandır.

Bu nə sözdü, söyləyirəm: söz tanrısı, söz şahıyam.
Boş danışıq karvandakı dəvə zəngi, ah-fəğandır.

Toxuduğum söz köynəyi bir hörumçək torudur ki...
Hər şerimin bər-bəzəyi quru qəfəs, quru candır.

Yersiz, yurdsuz bir it kimi hey qovulmaq ar deyilmi?
Fələk deyir: – Cəhənnəm ol, bat quyuda, çək, cəzandır.

Hümmət sikkəxanəsində öyünümmü mis quruşla?
Fil önünə necə çıxsın türkmən köçü fağır-fağır?

Şeir fənni nə şeydi ki, onunla sən fəxr edəsən?
Bilmirsənmi “yaxşı şeir – ən çoxu yalan olandır”.

Hansı elmin söz köynəyi çıxarılsa, yoxdu fərqi,
Məğzi geyər başqa libas, ya zərxara, ya da cındır.

Fəqət şerin zər donunu çıxarsan, heç nəyi qalmaz,
Nə yazılar, nə oxunar, görərsən ki, lüt-üryandır.

Amansızam, mən hər şeyi əks edirəm ayna kimi,
Güvəndiyim bir qala var: üzüm bərkdir, canım candır.

Bəzən mehdən belə qorxan bir çırağın şöləsiyəm,
Quruyuram ayaq üstə. Addımım ləng, özüm ağır.

Mən bu dünya çəkisində bircə dirhəm deyiləm heç,
O dünyada qızıldan da ağır gələn bir bahadır.

Mənə hümmət yolu göstər, Pərvərdigar, ey tacidar!
Xilas olum o yoldan ki, bizi yoldan çıxarandır.

Saç feyzini, qıl mədəd ki, şirni verim ariflərə,
Görsün mənim mehmanlarım bu mizban da bir mizbandır.

Təkcə sənə sığınmışam, özgə heç bir kimsəyə yox,
Ənam, nemət istədiyim elə yalnız bu ünvandır.

Vur naxışlar evində sən yenlərimə yarlığını,
Əl yelləyim köhnələrə, köhnə hikmət başqatandır.

Hasarındır könlum sənin, xəbislərdən gözlə məni:
Bir yuvaya sığa bilməz mələk, şeytan... onu qandır.

Etmə tənbeh, mən kiçiyəm. Görmə eybim, hələ çiyəm.
İkiüzlü, ondilliyəm, məni sağalt, məni yandır.

Keç suçumdan, taqsırımdan, qıl nəvaziş, oxşa məni.
Xəcalətim zərurətdən, üzrüm bəlkə qəzadandır.

Hər varlığın üzərində həlak, ölüm damğası var,
Ölməz, vacib bircə sənsən – kainatı yaradandır.

Mənə elə nişan ver ki, tapa bilim nişanəni,
Yox, yanıldım, keç suçumdan, Xaliq axı binişandır.

Sənə səcdəm sayəsində çarpır, hələ sağdı qəlbim,
Bu səadət ucbatından varam, varlıq cavidandır.

Mən çarmıxa çəkilmişəm öz əlimlə öz cismimdə,
Xilaskarım əgər varsa, tək özünsən, tək Yəzdandır.

Ulu həzrət, mənə barı bircə kərə yetir diqqət,
Dərd ümmanı ürəyim də görsün bir yol şadimandır.

Nizaminin səhvi olsa, heyrətlənmə, əfv et özün,
Kimsə qaçıb qurtulamaz, tale özü hökmrandır.

İlk nəfəsin sevincini mənə özün bəxş etmisən,
Son nəfəsdə üstümdə ol, ölməyimə haqq qazandır.

Zınqırovlar zınqıldadı, budur, yola düşür karvan.
Sən bu qədim düşərgədən can mülkünə yönəl, ey can!

Çalınan zəng öz naləndir – karvanına ulu başçı,
Sən bu karvan zəncirində zəng səsinə həmdəm, hayan.

Oyuncaqsan, nə qədər ki sən bir qapı cəftəsisən,
O zəng kimi nalə çək, get, istəmə, ya istə aman.

Bu vadidə təhlükə var, buna görə inləyir zəng.
Bəs bu cəftə neçin inlər? İçi boşdur, özü nalan.

Dərd sədalı zəng üzürlü, cəftə ondan uzürlüdür,
Ürəyinin yoxluğundan çəkir nalə, qılır əfqan.

Dörd hərfdi “cahan” sözü... qoy üstə dörd barmağını.
Yerdən göyə məsafə də dörd barmaqdan kəmdir, inan.

Cahan səni puç etməmiş, sən cahanı puç bil, çəkil.
O, üstündən xətt çəkməmiş, sən üstündən xətt çək əlan.

Çək dünyadan gözünü ki, səni cahil bilməsinlər,
Ağır olsan, ağır zəncir açılmaz əl-ayağından.

Ağaların libasına zinət olan hər nə varsa,
Təbəssümlə bir əl yellə ona, ayrıl bu dünyadan.

Səadəti cahanda yox, dində ara... çün bu bağda
Yusif köynəyinə oxşar nə ətir var, nə ərğəvan.

Boğ şəhvəti, dinə güc ver... üzərliyin, udun külü
Azsa, demək, rayihəsi vurar səni lap uzaqdan.

Bilik bizim darğamızsa, tamah onun qonşusudur,
Sağdı Rüstəm, amma durur hələ ağ div, Mazandaran.

Yürü hikmət yolu ilə, qovuş qeybin çeşməsinə,
Eyib, qüsur axtarmasan, min bir hikmət qavrayarsan.

Həm fələyin ulduzlarla ünsiyyəti xoşagəlməz,
Həm də yerin təbiəti insanlarla uyuşmayan.

Əgər Qurana əl bassan, ulduzlardan qurtularsan,
Quran Mehdi beşiyidir, Mehdi-sahib axir zaman.

Hər nə Quran dəzgahında toxunmayıbsa, rədd elə,
Hər nə deyilsə imandan, qov, kənar et astanandan.

Köhlənini Tanrı əmri, peyğəmbərin şərilə çap,
Tanrı nə cür söyləmişsə, qurulmuşdur o cür cahan.

Şəriət bir xidmətçi tək hazır durub qarşındaca,
Təmənnasız qula qul ol, sən də çalış cannan, başnan.

Dünya-möhnət burulğanı... gözün, könlün varsa, yatma.
Burulğanda mürgüləmək aman vermiş kimə, haçan?

Bu gəmiyə minmisənsə, gecə-gündüz ayıq davran,
Yalnız ayıq davranışla qalxır yelkən, sapmır sükan.

Sən insansan, mələk qəlbi, div xisləti sənlə əkiz...
Nədən səndə nişan varsa, o surətdə olacaqsan.

Eyni insan övladını neçə rəngdə görmüşük biz,
Bir dəmirdən nal kəsilir, o birindən süngu, qalxan.

Hər bir qara hindlinin də öz nəsəbi, öz yolu var:
Biri oğru, biri doğru – Haqqa keşik çəkən arslan.

Yer xalçası – qanlı bir teşt, bic doğulmuş nəfsin də – şam.
Nə vaxtacan xizəran tək o xalçanı mıxlayasan?

Sən göy rəngə meyl eləsən, qalxar başın fələyəcən,
Qırmızı, ya sarı umsan xəzan kimi kül olarsan.

Cəm halında müşk ahunun göbəyində, dar kisədə...
Yayıldımı, ipək olur, tirmə olur ona yorğan.

Tozlu xirqə geyənlər var, qəlbi səhər, beyni Günəş.
Evdar qadın kül altında köz saxlayar zaman-zaman.

Fələk damı sakininin geyindiyi göy olsa da,
Arpa cadı, göy-göyərti əskik olmaz masasından.

Bu nəsihət vacibdir ki, zərlə insan ulu olmaz,
Yüyürməklə keçi artmaz, ibrətlidir bu söz, dastan.

Sarı qızıl yaranıb ki, bəxş edəsən insanlara,
Sarılığı sevirsənsə, buyur, bağda bol zəfəran.

Bərbəzəkdən bir fayda yox... qızıl tapsan ver möhtaca,
Ömrün boyu qızıl kimi həm qoca ol, həm də cavan.

Nə qədər ki, sür-sümüyün dönüb sürmə olmayıb, qalx!
Şəriətin torpağıyla sürmələnib hümmət qazan.

Cilov çəkən qul olmamış, daşı sultan damğasını,
Xəlifənin həlqəsini öz boynunda güc, qüvvə san.

Boyun miğfər daşımalı, budsa damğa... Bu səbəbdən
Boyun əti dadlı olur, köklük buda gətirir can.

Göz alması – səma... bir cüt qara gövhər işıq alır
Səlcuqlular hilalından, Abbaslılar bayrağından.

O bayrağın göz qarası qoy heç vədə əskilməsin,
Əskilərsə ağ rəng, nə qəm, sökülləcək onsuz da dan.

Qoy qaradan ağa qədər hökm eləsin bu qara rəng,
Bu qaranlıq sayəsində zənci belə şad, xuraman.

“Sultan!” demək nəyə lazım? Səndən betər quldu sultan.
Ona qul ol... sultanlara tac verəndir o hökmran.

İstəsən ki, o dünyada əzizləsin ağan səni,
Bu dünyada qullarını sev, əzizlə bəri başdan.

Bir yazığın saçlarına sən əl çəksən nəvazişlə,
Məzarına günəş doğar, qiyamətdə odlanmazsan.

Olma zalim, çün tərkinə ədaləti bağlamışlar.
Adilliyi bacarmasan, barı zülmü saxla, dayan!

Ölkə düşmən kəsiləcək zalimlərə qiyamətdə,
Bir quyudur alçaqların yolundakı hər nərdivan.

Mələk səni şeytanlardan xərac alan tanısın qoy,
Heç bir kəsin çörəyinə olma bais, az havalan.

Bir içim su, çörək üçün hər ayağın tozu olma,
Gör nə günə saldı fələk, Adəm ilə Hüseyni an.

Cülab, şərbət olsa belə, özgə arxdan su içmə sən.
Göz çək özgə çörəyinin hətta ayə naxışından.

Hümmət şiri ol, ye ancaq öz əlinin qazancını,
Ovla... çölün heyvanları mehman gəlsin sənə, mehman.

Gör hardadır gücsüzlüyün, əl çək “Mən! Mən!” deməkdən... ey
Dünən kölə, bu gün əmir, bayaq xəstə, indi loğman.

Gözlərində yaş qalıbsa, ağla, qorxma naziklikdən,
Mirvarini seçmək üçün nazik sapı seçir insan.

Qaldır məzar pərdəsini, gör zamanın əzizləri
O pərdənin arxasında nə gündədir... düşün bir an.

Nuşirəvan qafasında ətək-ətək qum, daş-kəsək.
Yəzdgürdün çələngində xırman-xırman qaratikan.

Daş bağa tək zireh geysən, balıq kimi pullansan da,
Sən də bir gün bu çovğunda qalxanını tullayarsan.

Bu göy beşik altında sən çocuq kimi gəzmə, sakın,
Dayə deyil, əjdahadır qarşındakı namehriban.

İlan yatır kafur üstə, əjdaha da xəzinədə
Kafur saçlı çal kaftarın gəl baş çıxar oyunundan.

Di gəl qorxma oyunbazın möhrə-möhrə daşlarından!
Əlində həm sapandı var, həm gərilmiş qövs-kaman.

Kor zəmanə görə bilmir mən gözlərin sevinciyəm,
Nə qəm, şadam zəmanənin gözlərinin korluğundan.

Fəzli inkar edənlərin gözlərinə qoy ağ gəlsin,
Bu cür məlun köpəklərə sür-sümük də çoxdur, inan.

Mən Gəncədə günahkar bir keşikçiyəm xəzinəmə,
Yəməndə suç bağışlayan, Xütəndə qandan qurtaran.

Göz yaşınla dəstəmaz al, şərbətin də – ağız suyun.
Təşnəliyə tab et, könül, nə qədər ki bu yurddasan.

Nə qədər ki daşda qalıb... gümüş almaz qiymətini,
Nə qədər ki sədəfdədir, dəyərsizdir inci, mərcan.

Otuz yaşlı, ey Nizami, vaxtdır, çəkil bir guşəyə,
Mən verdim öz öyüdümü, necə qansan, eləcə qan.

Nə vaxtacan deyəcəksən: – Ey Kəbə, mən xidmətçinəm,
Çağırmayıb... getməmisən, barı xidmət qıl uzaqdan.

Vaxtı gəlmiş fələyin zərləri heyrətdə olar,
Tutular xanələri, pərdeyi-zülmətdə olar.

Gündüz ilə gecənin xətti olan ağla qara
Sənlə mən əmr eləsək, görkəmi zinətdə olar.

Su sızır kürreyi-ərzin bütün ətrafından,
Parlayır al Günəş altında hərarətdə olar.

Möhləti var hələ bu dövr eləyən çərxi-fələk
Aləmin dörd yanına seyrü-səyahətdə olar.

Nola yüngül dolanaydı başımız üstdə fələk
Yüngül olduqca dəyirman daha rahətdə olar.

Öküz üstundə durur çünki bizim Yer kürəsi,
Hər nə tiksən dağılar, burda min afətdə olar.

Pəncələşsə fələyin şiri ilə yer öküzü,
Varmı onda bu hünər, sonra müsibətdə olar.

Qorxuram xain ürəklər doludur aləmdə,
Öküz üstünlük edər, şir də xəcalətdə olar.

Hər zirək quş uca bilməz bu yaşıl göylərdə,
Çox göyərçin bu yaşıllıqda əsarətdə olar.

Xızr tək tərk elə Bağdadını bu dünyanın,
Ayağın Dəclə üçün körpü ləyaqətdə olar.

Sən bir Allah ilə ol, aləmi sel bassa belə,
Bir tükün də elə zənn etmə rütubətdə olar.

Eylə ol bircə dəfə bu fələk ümmanında,
Ta ayaq lövbər olub təslimə adətdə olar.

Doğruluqla yeri ki, sərv tək azad olasan,
Tərəzi arpa qədər müşk ilə nikhətdə olar.

Eylə tərpən ki, yalançı deməsinlər adına,
Doğru olsan adın hər ölkədə şöhrətdə olar.

Elə rəftar elə dünyayə inandır özünü,
Yalanın olsa da, dillərdə sədaqətdə olar.

Din evində Ömərin ədlini sən tazələsən,
Div sənlə döyüşə nəylə cəsarətdə olar?

Əfi zümrüdə baxıb gözlərini kor eləyər,
Quranı dinləyib iblis fəlakətdə olar.

Xəlil addımı ilə sən yolu təslim elə gəl,
Onda quldur dəyişib düzlüyə hörmətdə olar.

Hay-haray eylə, təpik vur ki, o qafil ürəyin
Oylə yatmış ki, oyaq bir də qiyamətdə olar.

Qübbə olmuş çox uca, əsla səsə səs verməz,
Səsini bilmə ki, Səncər səsi qüdrətdə olar.

Hər ürək ki, çəkə ah, tapmaz o, Musa odunu,
Xızr tək hər su içən sanma kəramətdə olar.

Dürr verərmi acı dərya suyu içməzsə sədəf,
Bir gövhər çün nə qədər qeyd ilə möhnətdə olar.

Gövhərindən bu qara rəngi qov, ey pak gövhər,
Bir böcək nur saçaraq gör nə ziyafətdə olar.

Sən uçub getsən əgər yeddi sütun göylərdən,
Günəşin süfrəsi ətrinlə təravətdə olar.

Fikri buymuş fələyin başını çövkan eləsin,
Bədəni top edərək baş kimi xidmətdə olar.

Xidmət öyrən, kim əgər xidmətə baş qoşmuşdur,
Get-gedə yüksələrək rütbədə, xidmətdə olar.

Darğa insaf eləsə, onda əmir mülkü alar,
Ədl göstərsə əmir şah cəlalətdə olar.

Qan içən olma çox, aləmdə ömrün az olsun,
Çox yeyən çox yaşamaz, axırı zillətdə olar.

Kömək et aləmə, aləm də sənə yar olsun,
Dostun olmazsa, həyatın da fəlakətdə olar.

Sən ipək ver baramaqurdu kimi hər nə yesən,
Ağzının şirəsinə şah tacı həsrətdə olar.

Elə iş gör, nəfsin ta ki, nabat şaxı ola,
Nəfsini qoyma sənubər kimi şiddətdə olar.

Sən cavanlıqda çalış nəfsini öldür ki, ilan
Qocalıb əjdaha olduqda xəsarətdə olar.

Ta ki düşdün bu yola, hər zaman anbara dən at
Ki, çəmən bircə dənə otla da dövlətdə olar.

Ordu lazımsa, çörək ver, çörəyi olsa əgər,
Ordu sahibi olar qarışqa, həşmətdə olar.

Dağıdıb ölkəni qan içməyi məzlumların,
Aya çil düşdüyü vaxt Gün də zəlalətdə olar.

Vay o gündən ki, dura cuşə gələ məzlumlar,
Hər tükün xəncər olub sənlə ədavətdə olar.

Heç kim etməz sənə insafı iki aləmdə,
Təkcə insaf sənə burda zəmanətdə olar.

Bəhmənin qollarını əjdaha bölmüşdür iki,
Burda heydər biləyiylə o, əziyyətdə olar.

Sən də Davud kimi nazikürək ol mumlar tək,
Poladı alsan ələ, o da mum adətdə olar.

Təbin övladı əgər təbpərəst olsa nolar,
Anaya körpə uşaq mehrdə, ülfətdə olar.

Üləma kuyinə yollan, yürü sən İsa tək,
Fələk əmriylə darın minbər nisbətdə olar.

Bəd fal açma, keçəcək, durmayacaq ulduzlar,
Burda ulduz nə edər, gör o, nə surətdə olar?

Yoxluq üstünə qədəm bas, əlini varlığa çək,
Ta bu tağ altda işin daim əmanətdə olar.

Ta ki öldün, bu təbiətlə tutuşdurma, dayan,
Özgə cür olsan, işin özgə əlamətdə olar.

Kim ki burda qul olub, orda o, sultan olacaq,
Kim ki sərtdir burada, orda o, zinətdə olar.

Bu Günəş sabuna bənzər fələyin teştində,
Ruhların paltarı ondan bu təharətdə olar.

Mən bu sabunla yudum əllərimi dünyadan,
Sən yumursansa, yuma atın əziyyətdə olar.

Ey Nizami, başını dairəsindən fələyin
Tez çıxar, yoxsa dilin sonra şikayətdə olar.

Beş dəfə təblini döy, indi köç avazını gəz,
Ta ki söz mülkü sənə bağlana, şöhrətdə olar.

Kimiyadır söz özü, bəxtin açar xəznəsini,
Torpağa düşsə də o, zər kimi qiymətdə olar.

Əyildi bel bu çəməndə qocalıqdan nə təhər,
Bu gün həyat budağından deyin, görüm nə bəhər?

Nə kölgə var ağacımda, nə turş bir meyvə,
Tökübdü meyvəsini yelləriylə hadisələr.

Bu əyri qədli fələklər qazır məzar mənə,
Bəyazı saçlarımın eylər əcəl haqda xəbər.

Həmişə nafə verər müşki-tər amma nə əcəb,
Doğuldu nafə mənim müşki-tərimdən bu səfər.

Ağızda düz iki sap inci, gövhərim vardı,
Zəmanə zülmü dağıtdı, töküldü o gövhər.

Dağıtdı mücrüdəki gövhərimi ulduz tək
Gələndə qəm şərqindən yeni ulduzlu səhər.

Yetişdi ömr sona, istəyirəm bayquş tək
Fənaya doğru bu virandan edim mən də səfər.

Əyildi qədd, başım torpağa mail oldu,
Mənəm ismət bağının tingi ki, xoş meyvə verər.

Əyildim eyləməyim üstümü qan ilə ləkə,
Gözümlə qan saçıram qanə boyandıqca cigər.

Ağardı saç, başıma sanki qalın qar yağdı,
Vücud çardağı uçmaqla görrəm indi xətər.

Başında bir qalanın qar olarsa su tökülər,
Odur ki, yaş axıdır bax bu nigaran gözlər.

Zəiflik öylə edibdir, sürüyüb kölgə kimi
Çəkərsə kimsə əgər yerlə, məndə görməz əsər.

Cahanda kimsə məni ondan ötrü yad etmir,
Bu halla söylə, zəif bir vücud nə yadə düşər?

Əyildi qədd kaman tək cahanda gör nə sayaq,
Çəkindi tiri-əcəldən, önündə tutdu süpər.

Səmayə doğru necə ruhum eyləsin pərvaz?
Bu qəmli, alçaq olan yerdə sındı balü pər.

Ümid meyvəsini tökdü cahan bağında,
Dağıtdı hər tərəfə hər dəm o daşlar, yellər.

Tökəndə meyvəsini dik dayanar daim ağac,
Əyildi qamətimin tingi ta ki, tökdü səmər.

Yox oldu baş iki çiynim içində biryolluq,
O, əcəl xəncərinin qorxusundan etdi həzər.

O dostlar eşqi ilə hey bu zəif gözlərdən
Süzüldü çöhrəmə yaş, çünki gəldi vəqti-səfər.

Zəiflik aldı məni, hüzn evində yurd saldım,
Dedim ki, astanadan keçmə çətinlik törədər.

Mənəm bu səhfədə son kəlmənin axır hərfi,
Nə məna məlumum oldu, nə də ki, bəlli cər.

Bayazı fərq eləmir gözlərim qaradan heç,
Yanağım Ay ilə Gün tək əgərçi şölə çəkər.

Keçibdir ömr, həyatım günahə sərf olmuş,
Odur ki, gördü xəcalətli məni bu ellər.

Düşübdür əllərimə əsməcəli titrətmə,
Sevinc badəsini burda nuş edim nə təhər?

Qonaqdır indi yanımda əcəl, nə çarə edim?
Həyatdan özgə şeyi məndən istəmirsə əgər?

Şirinlik almadı ağzım həyatda bir ləhzə,
Südümlə şəkkərim ağzımda daddı təkcə zəhər.

Həyat mənzilinə indi vida eyləyirəm,
Əyildi qədd, məni ağuşa çəkmək istər.

O qədər düşmüşəm əldən ki, hər an qorxuludur,
Bədəndə üzvlərim parçalanıb özgələşər.

Mühasib əlləri tək mən yıxıla-qalxa daha,
Təəccüb eylə ki, illər sayıram şamü-səhər.

Bu bağın istəmirəm abü-həvasıyla olam,
Yetişdi Xızr suyu, İsa dəmindən də zərər.

Gözümdən axdı bulud tək sular həsrətdən,
Cavanlıq ötdü yaman tez, dalınca qaldı nəzər.

Cavanlıq itdi əlimdən, yox oldu yollarda,
Bu əyri qəddim ilə göz onu yerlərdə gəzər.

Etimad eyləməsəm kölgə kimi divarə,
Bu halda durmağa hardan tapılar məndə təpər?

Ətirlə, rəng ilə aldatdı məni tifil kimi,
Zəmanə aldı mənim gəncliyimi burda hədər.

Sevinc mülkü verir müjdə eyş-işrətdən,
Qulaqda ağ tüküm amma yetirdi özgə xəbər.

Cahanda hey yıxıla-qalxa ruzi axtarıram,
Ağıl deyir ki, qarışqa necə gör danə çəkər?

Zəmanə hadisələr daşını yağdırdı yaman,
Nə qədər qoydu qala çərx məndə, nə gövhər.

Hünərlə fəzlimi hər eyb gəzənlər dandı,
Betərdir onlara hər eybdən indi bu hünər.

Mənim ki qəlb evimi nurə qərq edib ürfan,
Bu əyri qəddimi etmiş özünə halə qəmər.

Həmişə düşdü düyün işlərimə minlərlə,
Bu yolda hansı cəhətdən üzümə bəxt gülər?

Bu dövr gülşəni içrə məni bax yıxmaq üçün
Ayağım üstünə göylər həmişə balta çəkər.

Cahanda yox xəbərim surət ilə mənadan,
Könüldə, gözdə görünmür bunlardan əsla əsər.

O qədər var günahım, hətta cəhənnəm əhli
Yanında görsə məni tez durub kənar gəzər.

Günah bağçasının əyri qədli tingi mənəm,
Zəmanə hey qurudur, yandıra məhşərdə məgər.

Həmişə səhv, xəta hərfi, kəlməsi ancaq
Qələmlə yazdı qəza səhfə-səhfə hökm, qədər.

Bu hərfi silsə silər gözdən axan tövbə yaşı,
Qəzayə tabe deyildir nə fayda burda qədər.

Bu yerdə hökm qəzanındır, əlimdən nə gəlir?
Keçirsə hər nə xəyaldan, mənəm ondan da betər.

Günahla ömrü keçirdim məni kim öldürsə,
Ağıl müftisi eylər qanımı burda hədər.

Odumla cuşə gələr çərxi-fələk ümmanı
Zəbanə çəksə əgər köksüm altda atəşlər...

Odur Kəbə sultanı yeddi ölkə təxtində,
Qara çətir başında, yaşıl diba əynində.

Dördkünc, uca təxtində Xosrovlar tək əyləşib.
Həlqəsinin pərgarı göylər dairəsində.

Ərəb əndamlı türkdür, hər gün min könül ovlar,
Ənbərdən qara xal var nurlu, ağ çöhrəsində.

Xalı tək olduğundan dərd də, bəla da tək-tək,
Qapı həlqəsi kimi daralmış, azdı fitnə.

Tərəzisi qızılın saflıq ölçüsü olmuş
Arpa boyda qüsur yox daşının çəkisində.

Müşkü ipək içində saxlayırlar, qaydadır,
Müşk xalı gizlənib yaşıl ipək içində.

Yolunda ehkamçılar "ləbbeyk" nərəsi çəkir,
Necə ki çəkəcəklər məhşər kəşməkəşində.

Gümüş navalçasında kövsərin şirin suyu,
Tüba şaxələnibdir sütununun çiynində.

Gəmiçilər yelkənsiz, lövbərsiz qalar bəlkə
Sükanı bərk tutmasa o, dünya gəmisində.

Hündür divarı – xətkeş, mehrabı-paytaxt olub
Altı yön pərgarına inayət cədvəlində.

Torpağının göbəyi saçır ərzə rayihə,
Min-min könül saflaşır ehramının dibində.

Daş xalçası üstündə qartal kimi oturmuş,
Üzərindən uçmamış hətta bir göyərçin də.

Ulu Tanrım, macal ver Nizamiyə, ölməmiş,
Ürəyim dağa dönsün onun ziyarətində.

Hayqırım ki, min şükür, ey Kəbənin sahibi
Kəbədən ətir saçır şahlığın da, ədlin də!

Təxtdə Kəsradan üstün, at belində Səncərdən,
Gözü var onda min-min Kəsranın, Səncərin də.

Dövlət öz əlindədir, ordular öz əlində,
Odur ərzin – Darası, Nüsrət əd Din Bişkin də.

Məlik şah oğlu Mahmud, Firidun oğlu Cəmşid,
Müzəffər oğlu Mənsur, Məhəmmədəli Bəkir də.

Ulduzlar içrə Günəş, fikirlər padişahı.
Dövlət öz əlindədir, ordular öz əlində.

Firiduna bayraqdaş, İskəndərə rütbədaş,
Tacidarlar başçısı, şəhriyarlar fövqündə!

Sayəsində rəiyyət coşğun əməklə məşğul,
Dövlət, əmin-amanlıq, sülh onun kölgəsində!

Dostlara qızıl səpir bahar yağışları tək
Düşmənlərlə çarpışır şir tək yeri gələndə.

Kiminsə ağ bəxti var, kiminsə bəxt ulduzu,
Odur bəxti açan da, parladan Ülkəri də.

Qeyzi, qəzəbi coşsa, xaqan təxti titrəyər,
Qeysər tacı dağılar... tufan yatır zəhmində.

Lütfü gülsə, gözəllər bəzək, çələng aparar,
Şahlar çatar sərvətə səxa xəzinəsində.

Xidmətindən qaçanın boynu keçər kəndirə,
Ya da qolunda qandal yatar zindan güncündə.

Çıxdı fikir taxtına, yalnız onda inandıq:
Bir şəxs iki aləmi yaşadarmış özündə.

Ey xəzinələr saçıb düzü dağa döndərən,
Ümman bircə damladır səxavətin önündə.

Sayəndə zülmün cismi üzülüb çöpə dönmüş,
Ədalət şaxələnmiş sənin himayətində.

Zindansız, qandalsız da yıxar düşməni qeyzin,
Oxsuz, qılıncsız belə ölürlər nifrətində.

Əsrin nərdtaxtasında zəri sərrast atırsan,
Rəqibin yolu bağlı – altı xanəsi səndə.

Şahın qədəmlərinə nə qədər inci səpdim,
Nə daş göründü, nə zər, heyhat, tərəzisində.

Nizami töhfəsini rədd etmə, ey ulu şah,
Min-min xəzinə heçdir sənin töhfən önündə.

Bu qara, ağ aləmdə hər gecən gündüz olsun,
Gecən gecəndən üstün, gündüzün gündüzündən.

Uca şahlıq təxtində daim gəncləş, yaşıl qal,
Aləm Tanrının olsun, bəşər sənin hökmündə.

Ağlın gözü işıqlanmış qəlb evinin çırağından,
Yaxşı olar bu nurilə gizli xəznə axtarasan.

Xəznə tapmaq istəyirsən sındır canın sütununu
Ki, xəznələr asanlıqla ələ gəlməz, anla bunu!

Əgər xəznə ilanısan, halqa olma qapıda sən,
Viranlıqdır xəznələrin şahmarına əsil məskən.

Səhv elədim, ilan olma, lap cənnətin ilanı da,
Ki, haqqında pis söz yazıb, verməsinlər səni bada.

Əgər cənnət istəyirsən, özün parla gövhər kimi,
Gecələri işıqlandır öz nurunla qəmər kimi.

Gecə Ay tək oyaq ol ki, sirlər əyan olsun sənə,
Əgər aləm görən Aysan, ya da şahsan bu aləmə.

Ancaq gecə mövcud olar səfalı üz, ayıq ürək,
Zülmət içrə həyat suyu və al yaqut tapılan tək.

Yaxşı olar ki, qarının öz xoruzu ayıq ikən,
Səltənətin ov qırğısı yatmış ola səhər erkən.

Mərdsən əgər süfrəndə sən qida elə öz qanını,
Çünki əzəl ana qanı bəsləmişdir bu canını.

İstəyirsən əgər balıq, quşla dolsun sənin süfrən,
Yolçu olma, ibrət götür Süleymanın zənbilindən.

Bu divlərin cövrünü sən çəkəcəksən, de nə qədər,
Zəngilər tək yaşa daim, Zənganlıya salma nəzər!

Özünə ad qoyanda da toxucu qoy, dəmirçi yox,
Dəmir yonsan heç olmasa açar düzəlt, nəinki ox.

Bu açarla zindanı aç, zəncirləri qır yerə at!
Bu açarla zindanları qıfıllayıb şadlıq yarat!

Elm oxuyla ovla əgər istəyirsən təmiz şikar,
Elm ilə ov şikar elə, ov itilə nə işin var?

Göydə fələk tərəzisin bir arpa da çəkə bilməz,
Yerdə əyar varındırsa, o tərəzi kara gəlməz.

Məşəl yandır əlinə al, gecə yola çıxan zaman
Ki, məşəlsiz, qaranlıqda yeriməyə yoxdur imkan.

Güman etmə dənizlərdə gəminə bir ziyan dəyər,
Tufanlardan qorxu olmaz “Allah kərim” desən əgər..

Dənizdə bir qorxu görsən, kişi kimi hümmətli ol,
Tələsərək ləngər salma, hər vuruşda cürətli ol!

Muradına müxalif bir külək əssə, düşmə ruhdan,
Bu küləyə qarşı durub, qələbə çal ona hər an...

Biçarə o kəsdir ki, onun yox yarı,
Yarsız olanın çətin keçər rüzgarı.
Bu bir neçə gün ömür tapılmaz bir də,
Varsa ürəyin, qoyma gedə dildarı.

Dünyada ədalətlə zəfər tapmışlar,
Zülm ilə bu dünyada zərər tapmışlar.
Hər yerdə paxıllıq hünəri danmışdır,
Mərdlər eyb örtüb də, hünər tapmışlar.

Aləmdə sənin qəddinə bir tay olmaz,
Dünyada o qaş-göz kimi ox-yay olmaz.
Can vermədi könlüm görüb ənbər zülfü,
Qəlbimdən axan qan necə bəs çay olmaz!

Bilməm niyə lütfündən əlamət yoxdur,
Sadiq qula bir zərrə kəramət yoxdur.
Eşqinlə sənin qəm çəkirəm, aşkardır,
Şadlıq çəmənindən bir əmanət yoxdur.

Bil, qaçma, a dərviş ürəyim, bir kərrə,
Yaxşıyla yamandan üz çevir bilmərrə.
Vardırsa əgər səndə düyün bir tükcə,
Yox faydası saç buraxmağın bir zərrə.

Dilləndi İraq pərdəsi, ey yar, yatma,
Saqi dolanır məclisi, dildar, yatma.
Boş durma, sabah açılmağa çox vardır,
Qablarda, tuluqlarda badə var, yatma.

Bir ud kimi can yanar bizim manqalda,
Qanlar saçar o, dövr çatan tonqalda.
Olsaq da uzaq, biz keçərik könlündən,
Biz dosta fədayıq, sən özgə əhvalda.

Baxmır necə gündəyəm, könül şeydadır,
Olmaz mənə layiq o hüsn, peydadır.
Yetməz sənə Keyqubad ola, ya Xosrov,
Divanə mənəm, başda bu nə sevdadır?

Dərdinlə sevinc tarlama düşmüşdür nəm,
Döymüş məni qəm yumruğu möhkəm-möhkəm.
Şadlıq necə eyləyim? Könül şadlanmır,
Ya qəm necə çəkməyim? Məni basmış qəm.

Etmirsə vəfa, ömrə amansız rüzgar,
Sən yaxşılıq ək ta nə qədər ömrün var.
Bir halda ki, heç kimsəyə qalmır dünya,
Barı qoruyun, inciməsinlər dostlar.

Hər kim ki düşər qəmə, bu qəmdən dinməz,
Tənha çəkilən qəm od olar, heç sönməz.
Bağçanda açan qəribə bir güldür bu,
Nə rəngi görünməz, nə ətri gizlənməz.

Ey göz, necə görmədin ki, canan getdi,
Gördü məni ağlar, necə xəndan getdi.
Tutdu ürəyim can ətəyindən, can ürək,
Yar silkib ətək, gör nə xuraman getdi.

Eşqin meyini daddım əyan dərdindən,
Gördüm nə qədər yaxşı-yaman dərdindən.
Bezdim, nə deyim qəminlə şirin candan,
Gəl sorma nələr gördüm, aman, dərdindən.

Bir söylə, o dürr danəsini, ey dildar,
Ağzından alıbdır, kimə vermiş rüzgar?
Bənzər ki, onu apardı dərya səmtə,
Göstərdi, dedi: – Dürr anadan böylə olar.

Dedim ki, sözüm sənə şəhadət versin,
Eşqində mənə Tanrı dəyanət versin.
Yar söylədi: – Arzun bu duadan nəymiş?
Vəslin – dedim. O dedi: – Qoy əlbət versin.

Mən yetməmişəm indi ki, bir dildara,
Bihudə dolannam, gəzərəm avara.
Ağlar, yazaram müdam cigər qanımla,
Aləmdə mən öz halımı hər divara.

Fəryada yetən varmı, etsəm ah, əfğan,
Səbr etsəm, ömür keçib gedib, mən peşman,
İşlər nəfəsim tək səni yad etməklə,
Qoymuş hamını istəyə nakam dövran.

Ney söylədi: – Çox oldu yerim torpaqlar,
Bir gün məni kəsdilər qələm barmaqlar.
Min zərbə yedim cahanda mən hər kəsdən,
Etsəm çox əgər nalə, buna üzrüm var.

Ey kaş ki görəydi o yarı insanlar,
Dərk eyləyə aşiqləri ta bir onlar.
Əldən gedələr, tərk edələr aramı,
Ta gülməyələr aşiqə zinhar, zinhar.

Yorğunca, zəif dərviş etsə ah, əfğan,
Dünya dağılar, qalmaz əsla şah, xaqan.
Yoxsulluq ilə yaxşı olar yol getmək,
Durduqca verir taxta, taca şah meydan.

Ey yel, sən ona dərdimi pünhan söylə,
Qəlbimdə olan yanğını tufan söylə.
Amma elə et könlü olmasın qəmgin,
Söz sal, arada danış nagahan söylə.

Rəngim sarıdır, rəhm yox o dilbərdə,
Eşqindən onun düşdüm əlacsız dərdə.
Axşam məni o yolda vurdu çiyniylə,
Allaha şükür, qalmadı arzum yerdə.

Soldu gül üzüm, saraldı, bax, dərdindən,
Qatlandı belim, əyildi, ah, dərdindən.
Sındırdı məni ayrılığın illərlə,
Üstümdə nə baş var, nə papaq dərdindən.

Yatmış, onu Yarəb, nola bidar eylə,
Hüsnün camının məstini hüşyar eylə.
Ya bixəbər et, bilməyim əslində kiməm,
Yaxud onu halımla xəbərdar eylə.

Qəlbim qoya, eyləsəm şikayət səndən,
Gör ki, nə deyər könül nəhayət səndən.
Sirr açmaq əgər olmasa bu, barəndə,
Eylərdim axır yaman hekayət səndən.

Sən qəlbimi söylədim pərişan etmə,
Bir busə yetir, qəlbimi al-qan etmə.
Heyran elədi məni, utanmış gəldi,
Göstərdi ləbi, dedi: – Bir dayan, etmə.

Olmuş yanağın müşk, saçın qan, ey mah,
Bir söz demərəm, dəlilsiz olsam hərgah.
Üz-müşk, hələ nafədə qalmış ancaq,
Zülfün ucu-qan, çıxır nafədən gah-gah.

İşrətdə idim dünən şirin bir dillə,
Toz qonmamış üstünə təzə bir güllə.
O bağladı zülfü boynuna kəndir tək,
Boynum ona bağlandı haman bir tellə.

Hüsn ilə üzün göydə bir Aydır, parlaq,
Tövbəylə günah oldu o üz, zülf ancaq,
Bənzər o qara xətt gül yanağında,
Sanki Çinə bir dəstə zənci gəldi qonaq.

## KİTABIN İÇİNDƏKİLƏR

QƏSİDƏLƏR



RÜBAİLƏR

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktorlar: | *Rauf Cəfərov*<br>*Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Alianna Duxanina* |
| Kompyuter yığıcıları : | *Bəsti Cəfərova*<br>*Aygün Məmmədova* |
| Korrektorlar: | *Pərinaz Səmədova*<br>*Aysel Qarayeva* |

Yığılmağa verilmişdir 28.04.2004. Çapa imzalanmışdır 05.11.2004.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 10. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 163.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.